QƏZET 1958-ci İLDƏN NƏŞR OLUNUR

# GƏNC MÜƏLLİM

**BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!**
*Məhəmməd Peyğəmbər (S.)*

Dekabr 2018
№ 10 (1097)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ


# DÜNYA AZƏRBAYCANLILARINA

**Əziz həmvətənlər!**
**Hörmətli soydaşlar!**

Milli birliyimizin rəmzi kimi hər il geniş qeyd etdiyimiz 31 Dekabr - Dünya Azərbaycanlılarının Həmrəylik Günü münasibətilə sizi səmimi qəlbdən salamlayır, hamınıza xoşbəxtlik və əmin-amanlıq arzulayıram.

Ümummilli lider Heydər Əliyevin azərbaycançılıq ideyalarını yaşadan müstəqil dövlətimiz milli həmrəyliyin gücləndirilməsinə xüsusi əhəmiyyət verir, dünya azərbaycanlılarının mədəni-mənəvi birliyinin daha da möhkəmləndirilməsi ilə bağlı ardıcıl tədbirlər həyata keçirir. Biz xarici ölkələrdə məskunlaşmış həmvətənlərimizin doğma Azərbaycanla əlaqələrinin dərinləşdirilməsi və ümummilli məsələlərin həllində yaxından iştirakının təmin edilməsi istiqamətində irəli sürülən səmərəli təşəbbüslərə hər zaman dəstək verirk.

2018-ci il xalqımızın tarixində şərəfli yer tutan Azərbaycan Xalq Cümhuriyyətinin 100 illiyinin geniş şəkildə keçirilməsi ilə yaddaşlarda qalacaqdır. Belə əlamətdar yubileyin təntənə ilə qeyd edilməsi həmvətənlərimizin qəlbində azadlıq və istiqlal duyğularını, ölkəmizin zəngin tarixi ilə haqlı iftixar hissini daha da gücləndirir. Bu gün əminliklə deməк olar ki, 100 il əvvəl mühacir həyatı yaşamağa məcbur olmuş Cümhuriyyət qurucularının və onların varislərinin Azərbaycanı müstəqil və qüdrətli dövlət kimi görmək arzuları artıq xoş gerçəkliyə çevrilmişdir.



Dünyada gedən mürəkkəb geosiyasi proseslərə, müharibə və silahlı qarşıdurmalara, qaçqın və məcburi köçkün problemlərinə, qlobal iqtisadi çətinliklərə baxmayaraq, Azərbaycan Respublikası qarşıya qoyduğu böyük məqsədlərə doğru inamla irəliləyir. Ölkəmizin sosial-iqtisadi sahədə əldə etdiyi uğurların nüfuzlu beynəlxalq təşkilatlar tərəfindən yüksək qiymətləndirilməsi bunu bir daha əyani surətdə sübut edir. Dünya Bankının “Doing Business 2019” hesabatında Azərbaycan ötən illə müqayisədə 32 pillə irəliləyərək 190 ölkə arasında 25-ci yerdə qərarlaşmış, 10 ən islahatçı dövlət siyahısına daxil edilmişdir. Ölkəmizin təşəbbüsü və yaxından iştirakı ilə irimiqyaslı transmilli layihələr uğurla icra olunmuşdur. 2018-ci ildə Avrasiyanın enerji xəritəsinin zənginləşməsində mühüm rol oynayan “Cənub Qaz Dəhlizi”nin və onun tərkib hissəsi olan TANAP boru kəmərinin istifadəyə verilməsi, həmçinin Ələt-Astara magistral avtomobil yolunun açılışı ilə Azərbaycan ərazisində “Şimal-Cənub” beynəlxalq nəqliyyat dəhlizi layihəsi üzrə bütün işlərin başa çatdırılması dövlətimizin iqtisadi potensialının artması, regionun tranzit və logistika mərkəzinə çevrilməsi, geoiqtisadi mövqeyinin güclənməsi baxımından xüsusi əhəmiyyət daşıyır. Cari ildə həm də növbəti telekommunikasiya peyki “Azerspace-2”nin orbitə buraxılması respublikamızın müasir rabitə və informasiya texnologiyaları sahəsində qazandığı nailiyyətlərin bariz təzahürüdür.

Ölkəmiz inkişaf etdikcə, daha qlobal xarakterli vəzifələri həll etmək imkanları da artır. Qarşımızda Ermənistanın hərbi təcavüzü nəticəsində işğal edilmiş torpaqlarımızın azad olunması kimi taleyüklü vəzifə dayanır. Azərbaycan pozulmuş ərazi bütövlüyünün bərpası yolunda ardıcıl və məqsədyönlü siyasət həyata keçirir. Soydaşlarımız da, öz növbəsində, yaşadıqları ölkələrin yüksək dairələrinin və nüfuzlu beynəlxalq təşkilatların diqqətinin Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsinin ədalətli həllinə yönəldilməsində, tarixi həqiqətlərin geniş ictimaiyyətə çatdırılmasında fəallıq nümayiş etdirməlidirlər. Azərbaycanın inkişafı və dünya birliyində mövqeyini möhkəmləndirməsi üçün hər bir həmvətənimiz ümummilli məqsədlər ətrafında sıx birləşməli, diaspor təşkilatlarının fəaliyyəti daha çevik əlaqələndirilməlidir. Əminəm ki, dünyanın hansı guşəsində yaşamasından asılı olmayaraq, bütün soydaşlarımız və həmvətənlərimiz bu prinsiplərə əsaslanaraq qarşıdakı illərdə də üzərlərinə düşən vəzifələrin yerinə yetirilməsində qüvvə və bacarıqlarını əsirgəməyəcəklər.

Sizi Dünya Azərbaycanlılarının Həmrəylik Günü münasibətilə ürəkdən təbrik edir, hər birinizə səadət, firavanlıq və işlərinizdə uğurlar diləyirəm!

**Bayramınız mübarək olsun!**

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 25 dekabr 2018-ci il*

# Elmi Şuranın iclası

**Dekabrın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq bildirib ki, iclasın gündəliyinə “ADPU-nun maliyyə-təsərrüfat fəaliyyəti haqqında”, “ADPU-nun Cəlilabad Filialının fəaliyyəti haqqında”, Monitorinq qrupunun rəhbərinin arayışı və cari məsələlər daxildir.**

Rektor Cəfər Cəfərov giriş nitqində qeyd edib ki, ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin (ADPK) sabiq direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müvafiq Sərəncamı ilə Dövlət Gömrük Komitəsinin Akademiyasının rəisi vəzifəsinə təyin edilib. Qulu Novruzov təhsil sahəsində müxtəlif məsul vəzifələrdə çalışıb, bu sahədə tanınmış, təcrübəli və nüfuzlu mütəxəssisdir. Qulu müəllim ADPU-nun nəzdində ADPK-də yeniliklərin, islahatların uğurla həyata keçirilməsində böyük xidmətlər göstərib. İnanırıq ki, o dövlət başçımız tərəfindən göstərilən yüksək etimadı layiqincə doğruldacaq. Rektor Qulu Novruzova ADPU-nun nəzdində ADPK-nin inkişafında və yenidənqurma işlərində səmərəli və əvəzolunmaz fəaliyyətinə görə təşəkkürnamə təqdim edib və ona uğurlar arzulayıb.

Qulu Novruzov göstərilən diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə təşəkkür edib.

ADPU-nun nəzdində ADPK-nin yeni təyin edilmiş direktoru, dosent İsrayıl İsgəndərov çıxış edərək ona göstərilən etimadı layiqincə doğruldacağını bildirib.

Rektor çıxışında həmçinin “2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı”nın təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı, ADPU-da Təhsil Nazirliyinin təşkilatçılığı ilə keçirilən Doktorantların və gənc tədqiqatçıların XXII Respublika elmi konfransı, Azərbaycan Müəllimlərinin XV Qurultayı, “ADPU-nun 2018-2019-cu tədris ili üçün iş planı”, universitetin 100 illik yubileyi münasibətilə hazırlanmış “ADPU-nun 2018-2021-ci illər üzrə Strateji İnkişaf Planı”, Filologiya fakültəsinin dekanı və kafedra müdirləri vəzifəsinə keçiriləcək seçkilər, professor-müəllim heyətinin, kafedraların və fakültələrin illik fəaliyyətinin Reytinq Qiymətləndirməsi, Kitabxana-İnformasiya Mərkəzinin və elmi-tədqiqat laboratoriyalarının yenilənməsi və onların fəaliyyətinin güclənməsi, həmçinin 2018-2019-cu tədris ilinin payız semestrinin imtahan sessiyasının şəffaf və obyektiv keçirilməsi ilə bağlı qarşıda duran vəzifələr barədə ətraflı danışıb.



İnzibati və iqtisadi işlər üzrə prorektor Ümid Mehdiyev “ADPU-nun maliyyə-təsərrüfat fəaliyyəti haqqında” hesabat məruzəsi ilə çıxış edib. Prorektor Ü.Mehdiyev bildirib ki, müasir dövrdə hansı sahədə fəaliyyət göstərməsindən asılı olmayaraq, hər bir təşkilatın əsas vəzifələrindən biri dayanıqlı maliyyə tədbirlərinin həyata keçirilməsi, düzgün strategiyalarla inkişafa nail olunmasıdır. ADPU hazırda yüksək elmi-pedaqoji kadr potensialı olan, filial və kolleclə birlikdə təxminən 18 min tələbə heyəti ilə pedaqoji kadr hazırlığını həyata keçirən böyük müəssisədir. ADPU-da islahatları həyata keçirmək və universiteti səmərəli vəziyyətə gətirmək 2016-cı ildən qarşıda duran əsas vəzifə olmuşdur.

ADPU-nun gəlirləri müxtəlif istiqamətlərdən formalaşır. Buraya ödənişli təhsildən daxil olan gəlirlərlə yanaşı, doktorant və dissertantlardan, təkrar ali təhsildən, davamlı təhsildən, əcnəbi tələbələrin hazırlıq kursundan və yataqxana xidmətindən daxil olan gəlirlər aiddir. Ali təhsil müəssisələrində yeni maliyyələşmə mexanizminin tətbiqi ilə bağlı dövlət sifarişi ilə ali təhsil müəssisələrinin bakalavriat və magistratura səviyyəsində kadr hazırlığının maliyyələşdirilməsi qaydalarına əsasən dövlət sifarişli tələbələrdən daxil olan vəsait də gəlirlərin formalaşmasına böyük təsir edir. ADPU-nun xərclər maddəsində əsas yeri əmək haqqlarının ödənilməsi tutur. Universitetin əməkhaqqı fondunun planlaşdırılması ştat cədvəlinə əsasən formalaşır. Eyni zamanda universitet işçilərinə cari ilin 11 ayı ərzində 3 dəfə mükafat verilib ki, bu da orta aylıq əməkhaqqının artmasına səbəb olub. ADPU böyük infrastruktura malikdir. Car ildə smeta ilə nəzərdə tutulan 1 nömrəli inzibati-tədris korpusunun binasının 3-cü mərtəbəsində əsaslı təmir işləri görülüb. Bütün istilik xəttləri, elektrik təchizatı yenilənib, binanın dam hissəsində təmir-bərpa işləri aparılıb. Ümumiyyətlə, təmir zamanı 26 auditoriya, 16 iş otağı əsaslı təmir edilib. Təmirdən sonra auditoriyalar yeni partalar, lövhələr, digər avadanlıqlar ilə təchiz olunub və istifadəyə verilib. Cari ildə digər diqqətçəkən işlərdən biri Heydər Əliyev Fondunun dəstəyi ilə 1 nömrəli inzibati-tədris korpusunun 14 mərtəbəli binasının fasad üzlüyünün yanğına davamlı, kompozit keramik materialdan üzlənməsi, bütün pəncərələrin və eyvan çıxışlarının yüksək keyfiyyətli alüminiumdan olan qapı və pəncərələr ilə dəyişdirilməsi olub. Bu fakt ölkə rəhbərliyinin təhsilə xüsusi diqqət və qayğısının bariz nümunəsidir.

**(Davamı 2-ci səhifədə)**

# Ümummilli lider Heydər Əliyevin anım mərasimi

***Dekabrın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi Fəxri Xiyabanda xalqımızın ümummilli lideri Heydər Əliyevin məzarını ziyarət edib, məzarı önünə əklil və gül dəstələri qoyub. Xalqımızın görkəmli oftalmoloq alimi, akademik Zərifə Əliyevanın da xatirəsi ehtiramla yad edilib, məzarı önünə gül dəstələri qoyulub. Sonra universitetin 2 nömrəli tədris binasındakı Heydər Əliyev Mərkəzində ulu öndər Heydər Əliyevin anım mərasimi keçirilib. Anım mərasimində Nəriman Rayon İcra Hakimiyyətinin (RİH) və Yeni Azərbaycan Partiyasının (YAP) Nərimanov rayon təşkilatının məsul şəxsləri də iştirak ediblər. Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib, ulu öndər Heydər Əliyevin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.***



Tədbirdə çıxış edən Heydər Əliyev Mərkəzinin baş mütəxəssisi Aytən Daşdəmirova bildirib ki, müasir Azərbaycanın qurucusu, ulu öndər Heydər Əliyevin adı zəmanəmizin ən böyük siyasət və dövlət xadimlərinin, qüdrətli şəxsiyyətlərinin sırasında yer almışdır. Heydər Əliyev həyatı mübarizə və qələbələrdən keçən, öz xalqının tarixi taleyində müstəsna rol oynayan dahi şəxsiyyətdir. Ulu öndər Heydər Əliyev bənzərsiz həyatı və zəngin fəaliyyəti ilə xalqımızın ümummilli lideri səviyyəsinə yüksəlmişdir. Heydər Əliyevin adı xalqımız üçün ucalıq rəmzinə, əməlləri isə hünər timsalına çevrilmişdir. Heydər Əliyev öz böyük xidmətləri ilə tarixin yaddaşında əbədiləşmiş ən böyük azərbaycanlıdır.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxışında qeyd edib ki, xalqımızın böyük oğlu, ulu öndər Heydər Əliyevin vəfatından 15 il keçir. Qədirbilən xalqımız hər il Ulu Öndərə vəfa borcunu layiqincə yerinə yetirir. Heydər Əliyev Azərbaycanı çətinlik girdabından xilas etmiş, müstəqil dövlətimizi qurmuş, gücləndirmiş, inkişaf perspektivlərini müəyyən etmiş və beynəlxalq miqyasda layiqincə tanıtmışdır. Heydər Əliyevin ən böyük xidmətlərindən biri Azərbaycanı öz layiqli siyasi varisi cənab İlham Əliyevə həvalə etməsidir. Bugünkü müstəqil, qüdrətli, sürətlə inkişaf edən, regionun lider dövlətinə çevrilən Azərbaycan ulu öndər Heydər Əliyevin şah əsəridir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin rəhbərliyi altında ölkəmiz həyatımızın bütün sahələrində böyük uğurlar qazanır.

Heydər Əliyev elm və təhsil sahəsində köklü və əsaslı dəyişikliklərin həyata keçirilməsini təmin etmiş, istedadlı azərbaycanlı gənclərin keçmiş Sovetlər Birliyinin tanınmış və nüfuzlu ali təhsil müəssisələrində təhsil almaları üçün səmərəli və məqsədyönlü fəaliyyət göstərmişdir. Bu siyasəti müasir dövrümüzdə dövlət başçımız cənab İlham Əliyev uğurla davam etdirir. Ölkə Prezidenti cənab İlham Əliyevin 16 noyabr 2018-ci il tarixli Sərəncamı ilə təsdiq edilmiş "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" ali təhsil sisteminin yeni və müasir inkişaf istiqamətlərinin, strateji hədəflərinin müəyyən edilməsi baxımından böyük əhəmiyyət kəsb edir. Belə ki, bu proqramın həyata keçirilməsi təhsilalanlara həm işlə təmin olunmaq, həm də təhsildə fasiləsizlik prinsipini gerçəkləşdirmək baxımından əlavə imkanlar yaradacaq. İkili diplomlar, xaricdə doktorantura təhsili ali təhsil sisteminin beynəlxalq standartlara uyğunlaşdırılması, universitetlərin rəqabət qabiliyyətinin artırılması, ali təhsil müəssisələrinin Avropa məkanına daxil olması, tədris proqramlarının təkmilləşdirilməsi və keyfiyyətin təmin olunması, universitetlərdə infrastrukturun və idarəetmənin daha səmərəli qurulması, Bolonya prosesindən irəli gələn dəyişikliklərin təcrübədə qavranılması, insan kapitalının inkişaf etdirilməsi, strateji əhəmiyyət kəsb edən sahələr üzrə yüksəkixtisaslı milli kadrların hazırlanması baxımından da çox faydalı olacaq. Bizim qarşımızda dayanan əsas vəzifə Azərbaycanın yeni inkişaf mərhələsində yüksək səviyyəli pedaqoji kadrlar hazırlamaqdır.



Tədbirdə Tarix və coğrafiya fakültəsinin Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının baş müəllimi, tarix üzrə fəlsəfə doktoru Taleh Cəfərov "Heydər Əliyevin siyasi portretinin cizgiləri" mövzusunda məruzə ilə çıxış edib. Məruzəçi çıxışında Heydər Əliyevin liderlik xüsusiyyətlərindən, xalqına, millətinə, Vətəninə məhəbbətindən, elm və təhsilə xüsusi diqqət və qayğı göstərməsindən, yüksək intellektual səviyyəyə malik gənc nəslin yetişdirilməsi üçün həyata keçirdiyi gənclər siyasətindən ətraflı danışıb.

Nərimanov RİH-in başçısının müavini İradə Mahmudova, YAP-ın Nərimanov rayon təşkilatının sədri Təmraz Tağıyev, YAP-ın təsis konfransının iştirakçısı və Naxçıvanda YAP-ın Qadınlar Şurasının sədri olmuş Südabə Qəhrəmanova çıxış edərək ulu öndər Heydər Əliyevin xalqımız və dövlətimiz qarşısında göstərdiyi böyük tarixi xidmətlərlə bağlı öz fikirlərini bölüşüblər.

Mərasimdə Tarix və coğrafiya fakültəsinin tələbə-gənclərinin Xalq şairi Zəlimxan Yaqubun "Böyük ömrün dastanı" poeması əsasında hazırladıqları bədii-musiqili kompozisiya təqdim edilib, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin tələbələrinin hazırladıqları dahi öndər Heydər Əliyevin həyat və fəaliyyətini əks etdirən videoçarx nümayiş etdirilib, xor kollektivinin ifasında "Ulu Öndər" mahnısı səsləndirilib.

**Orxan Abdullayev**

# Elmi Şuranın iclası

**(Əvvəli 1-ci səhifədə)**

Prorektor Ü. Mehdiyev çıxışının sonunda "ADPU-nun 2018-2021-ci illər üzrə Strateji İnkişaf Planı"na görə maliyyə-təsərrüfat sahəsində qarşıda dayanan vəzifələr barədə ətraflı məlumat verib, universitetin imicinin yüksəldilməsi, yüksək keyfiyyətli təhsil xidmətlərinin göstərilməsi, təhsilverənlərin sosial vəziyyətinin yaxşılaşdırılması və infrastrukturun gücləndirilməsi ilə bağlı təkliflər irəli sürüb.

Professor Himalay Qasımov, professor İramin İsayev, professor Nailə Verdizadə, professor Nizami Xuduyev, professor Zemfira Abdullayeva, dosent Vaqif Əliyev və başqaları çıxış edərək hesabat məruzəsinin qənaətbəxş olduğunu bildiriblər.

Elmi Şura Ü. Mehdiyevin hesabatını qəbul edib.

"ADPU-nun Cəlilabad Filialının fəaliyyəti haqqında" filialın direktoru, dosent Xudayar Sultanlı hesabat məruzəsi ilə çıxış edib. Dosent X. Sultanlı qeyd edib ki, filialda Pedaqoji fakültə və 3 kafedra - Ümumelmi fənlər kafedrası, İxtisas fənləri kafedrası, Təbiət və riyazi fənlər kafedrası fəaliyyət göstərir. Ümumilikdə filialda 95 nəfər işçil çalışır. Hazırda filialda 4 ixtisas üzrə - "İbtidai sinif müəllimliyi", "Tarix və coğrafiya müəllimliyi", "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi", "Məktəbəqədər təlim və tərbiyə" ixtisasları üzrə kadr hazırlığı həyata keçirilir. 4 ixtisas üzrə ümumilikdə 352 nəfər tələbə təhsil alır. Filialda 1 nəfər elmlər doktoru, professor, 15 nəfər fəlsəfə doktoru, 5 nəfər dosent, 1 nəfər dosent əvəzi, 20 nəfər baş müəllim çalışır. Filialın müəllimlərindən 2 nəfər "Azərbaycan Respublikasının Əməkdar müəllimi" fəxri adına layiq görülüb, 2 nəfər "Tərəqqi" medalı, 1 nəfər isə "Qabaqcıl təhsil işçisi" döş nişanı ilə təltif edilib. Son 5 ildə filial əməkdaşları 342 elmi məqalə və tezis, 22 monoqrafiya, dərslik və dərs vəsaiti, 13 proqram və metodik tövsiyə yazaraq çap etdiriblər. Filialın tələbələri pedaqoji təcrübəni qabaqcıl və tanınmış məktəblərdə keçirlər.

Filialda tələbələrin ictimai fəallığını təmin edən 3 ictimi təşkilat: Tələbə Gənclər Təşkilatı (TGT), Tələbə Elmi Cəmiyyəti (TEC), Tələbə Həmkarlar Təşkilatı (THT) fəaliyyət göstərir. İctimai təşkilatların iştirakı ilə filialda davamlı olaraq şeir, rəsm, şahmat və esse müsabiqələri, fənn olimpiadaları, elmi seminarlar keçirilir, dövlət əhəmiyyətli bayram günləri qeyd edilir. Filialın tələbələri respublika konfranslarında elmi məqalə və tezislərlə çıxış edirlər. Filialda müntəzəm olaraq hər həftənin şənbə günü intellektual yarış keçirilir. Bununla yanaşı, Lənkəranda keçirilən "Azərbaycan Birincisi" layihəsində davamlı olaraq, eləcə də ADPU-da və digər universitetlərdə keçirilən intellektual yarışlarda fəal iştirak edirlər. Tələbə-gənclərin asudə vaxtlarının maraqlı və səmərəli keçməsi məqsədilə muzeylərə və tarixi abidələrə səyahətlər təşkil edilir.

Filial dövlətin təhsil siyasətinin uğurla həyata keçirilməsi üçün əzmlə çalışır. Müasir əmək bazarının tələblərinə cavab verən, milli və ümumbəşəri dəyərləri özündə birləşdirən kadrların hazırlanması, yüksək mənəvi-əxlaqi keyfiyyətləri özündə əxz edən, Vətəninə, xalqına, dövlətinə sadiq vətəndaşlar yetişdirmək filialın ən mühüm hədəflərindən biridir.

ADPU-nun Cəlilabad Filialında aparılmış monitorinqin nəticələri barədə Monitorinq qrupunun rəhbəri, Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov məlumat verib.

Elmi Şura dosent X. Sultanlının hesabatını qəbul edib.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov cari məsələlər barədə məlumat verib. Cari məsələlər müzakirə olunub və müvafiq qərarlar qəbul edilib.

Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev tədris planlarında edilən dəyişikliklər barədə məlumat verib. Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov fakültədə "Davamlı insan inkişafı" fənninin tədris olunmasını təklif edib. Dosent Ş.Pənahovun təklifi Elmi Şura üzvləri tərəfindən qəbul edilib.

Elmi katib, siyasi elmlər üzrə fəlsəfə doktoru Asif Axundov Elmi Şuranın qərarlarını Şura üzvlərinin diqqətinə çatdırıb.

Sonda ADPU-nun rektoru yanında 25 nəfərdən ibarət Keyfiyyət Komissiyasının tərkibi təsdiq edilib.

**Mənsur İbrahimli**

# Azərbaycan Xalq Cümhuriyyəti Parlamentinin yaradılmasının 100 illiyi ilə bağlı tədbir



Dekabrın 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kimya və biologiya fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə Azərbaycan Xalq Cümhuriyyəti Parlamentinin yaradılmasının 100 illiyi ilə bağlı tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, universitetin müəllim və tələbələri iştirak ediblər. Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

Tədbirdə qeyd edilib ki, bu gün Azərbaycan xalqının həyatında çox əlamətdar və şərəfli bir gündür. Bu gün Azərbaycan Xalq Cümhuriyyəti Parlamentinin yaradılmasının 100 ili tamam olur. 1918-ci il dekabr ayının 7-də Azərbaycan Xalq Cümhuriyyəti Parlamentinin yaradılması böyük ictimai-siyasi əhəmiyyət kəsb edən hadisə idi. Azərbaycan Xalq Cümhuriyyəti Parlamentinin yaradılması böyük və zəngin ənənələrə malik dövlətçilik tariximizin parlaq səhifəsidir. Parlamentin yaradılması Azərbaycan Xalq Cümhuriyyətinin həyata keçirdiyi dövlət quruculuğunda ən mühüm addımlardan biri idi. Parlamentin yaradılması ilə respublika ərazisində yaşayan bütün xalqların seçki hüququ qanunla təsbit edildi. Vurğulanıb ki, Azərbaycan Xalq Cümhuriyyəti Şərqdə parlament tipli ilk respublika olmuşdur. Azərbaycan Xalq Cümhuriyyəti bütün dünyada qadınlara seçki hüququ verən ilk dövlət olmuşdur. Cəmi 23 ay yaşamasına baxmayaraq, Azərbaycan Xalq Cümhuriyyəti dövlətçiliyimiz tarixində dərin iz qoymuşdur. Bugünkü müstəqil Azərbaycan Respublikası Azərbaycan Xalq Cümhuriyyətinin varisidir. Ulu öndər Heydər Əliyev yenidən hakimiyyətə qayıtdıqdan sonra müstəqil Azərbaycan dövlətini qurmuş, gücləndirmiş və onu beynəlxalq miqyasda layiqincə tanıtmışdır. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev uğurla həyata keçirdiyi davamlı inkişaf siyasəti dövlətimizin daha da güclənməsini, beynəlxalq siyasi nüfuzunun yüksəlməsini təmin etmişdir.



Tədbirdə Kimya və bilologiya fakültəsinin tələbələrinin hazırladıqları bədii-musiqili kompozisiya təqdim edilib, Azərbaycan Xalq Cümhuriyyəti ilə bağlı videoçarx nümayiş olunub. Azadlıq, müstəqillik, xalqa, millətə, Vətənə, dövlətə sevgi hissini təbliğ və tərənnüm edən bədii-musiqili kompozisiya tədbir iştirakçılarında xoş əhvali-ruhiyyə yaradıb.

Sonda çıxış edən Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov tədbirin yüksək səviyyədə təşkil olunmasına görə Kimya və biologiya fakültəsinin müəllim və tələbələrinə təşəkkür edib və onlara uğurlar arzulayıb.

# Akademik Ramiz Mehdiyevin yeni kitabının təqdimatı

Dekabrın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tarix və coğrafiya fakültəsinin təşkilatçılığı ilə universitetdə Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) həqiqi üzvü Ramiz Mehdiyevin "Qriqoryan kilsəsi Səfəvilər dövlətinə qarşı casusluq vasitəsi kimi. XVII-XVIII əsrin I rübündə" ("Qriorianskaə üerkovğ kak instrument şpionaja protiv Sefevidskoqo qosudarstva. XVII-pervaə çetvertğ XVIII vv.") adlı kitabının təqdimatı keçirilib. Tədqimatda ADPU-nun rəhbərliyi, Tarix və coğrafiya fakültəsinin professor-müəllim heyəti, fakültə dekanları, kafedra müdirləri, AMEA-nın Abbasqulu ağa Bakıxanov adına Tarix İnstitutunun əməkdaşları iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, biz bu gün tarix elmimiz üçün çox aktual olan bir mövzunu müzakirə etmək üçün toplaşmışıq. Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri, AMEA-nın həqiqi üzvü Ramiz Mehdiyevin "Qriqoryan kilsəsi Səfəvilər dövlətinə qarşı casusluq vasitəsi kimi. XVII-XVIII əsrin I rübündə" ("Qriorianskaə üerkovğ kak instrument şpionaja protiv Sefevidskoqo qosudarstva. XVII-pervaə çetvertğ XVIII vv.") adlı yeni kitabı işıq üzü görüb. Qeyd etmək lazımdır ki, akademik Ramiz Mehdiyev Səfəvilər dövləti ilə bağlı bir neçə kitabın müəllifidir. Böyük alimin geniş və hərtərəfli elmi-tədqiqatların nəticəsində ərsəyə gətirdiyi həmin kitablar elmi ictimaiyyət tərəfindən yüksək qiymətləndirilib. Yeni əsərin əsas özəlliyi Ramiz Mehdiyevin həm tədqiqatçı-alim və həm də dövlət xadimi olaraq Səfəvilər dövlətinə yeni prizmadan yanaşmasıdır. Bu əsər Azərbaycan tarixşünaslığında və siyasi elmində Qriqoryan kilsəsinin Səfəvilər dövlətinə qarşı kəşfiyyat və siyasi-ideoloji fəaliyyətinin geniş işıqlandırılmasına göstərilən ilk cəhdir. Çoxsaylı mötəbər elmi mənbələr əsasında yazılmış bu fundamental əsərdə problemlərin qoyuluşu və həlli tamamilə yenidir. Əsərdə Vatikan tərəfindən göndərilmiş katolik missiyasının qeyd etdiyimiz dövrdə Səfəvilərə qarşı həyata keçirdiyi ideoloji və casusluq fəaliyyətinin strategiya və taktikası, həmçinin Qriqoryan kilsəsinin katolik missiyası ilə əlaqələri ardıcıl və dəqiq aydınlaşdırılır. Əsərdə erməni siyasi elitasının satqınlığı, Qriqoryan kilsəsinin fitnəkar, pozucu, casusluq fəaliyyəti ifşa edilir. Konkret elmi-tarixi faktlara söykənən bu əsər sistemli fəaliyyətin uğurlu davamıdır. Əsərin rus dilində yazılması onun istifadə imkanlarının və oxucu auditoriyasının genişlənməsinə imkan verir. Bu əsər bütövlükdə tarix elmimizə böyük töhfədir.





Tədbirdə çıxış edən AMEA-nın Abbasqulu ağa Bakıxanov adına Tarix İnstitutunun professoru Şahin Fazil, ADPU-nun Azərbaycan tarixi kafedrasının müdiri, dosent Naibə Əhmədova, tarix üzrə fəlsəfə doktoru, dosent Dilavər Əzimli, ADPU-nun Azərbaycan tarixi kafedrasının baş müəllimi, tarix üzrə fəlsəfə doktoru Elman Mirzəyev akademik Ramiz Mehdiyevin mötəbər elmi-tarixi mənbələr əsasında yazdığı yeni əsərinin çox maraqlı və aktual mövzuya həsr olunduğunu bildiriblər. Çıxışlarda qeyd edilib ki, bu əsərdə Qriqoryan kilsəsinin Səfəvilər dövlətinə qarşı apardığı pozucu kəşfiyyat və siyasi-ideoloji fəaliyyət geniş işıqlandırılır. Əsər həmçinin Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin obyektiv araşdırılması üçün böyük əhəmiyyət kəsb edir.

Sonra kitab haqqında müzakirə aparılıb. AMEA-nın müxbir üzvü, professor Vəli Əliyev, professor Himalay Qasımov, dosent Sevinc Seyidova, dosent Elmira Süleymanova çıxış edərək bu dəyərli əsərin bütün Türk xalqları üçün mühüm əhəmiyyət kəsb etdiyini vurğulayıblar.

Sonda rektor Cəfər Cəfərov professor-müəllim heyətinə tələbə-gənclərə tariximizi dərindən öyrətmək üçün onlarla bu sahədə işi daha da genişləndirməyi tapşırıb.

**Mahirə Mustafayeva**

# "Media və təhsil dialoqu" mövzusunda növbəti təlim-konfrans

***Dekabrın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Media və təhsil dialoqu" mövzusunda növbəti təlim-konfrans keçirilib.***



Konfransda ADPU-nun Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Təhsil Nazirliyinin əməkdaşları, media qurumlarının, ali təhsil müəssisələrinin mətbuat xidmətlərinin rəhbərləri, təhsil ekspertləri iştirak ediblər.

Təlim-konfransdan əvvəl akademik Yusif Məmmədəliyev və akademik Zahid Xəlilov adına auditoriyalarda pedaqoji ixtisaslara yüksək balla qəbul olmuş tələbələrlə görüş keçirilib və dərs prosesi izlənilib.

ADPU-nun Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev konfransı açaraq belə təlimlərin media-ali məktəb əlaqələrinin inkişafına töhfə verəcəyinə əminliyini bildirib. Fikrət Rzayev qeyd edib ki, 20 min nəfərə yaxın tələbə-müəllim heyətinə malik universitet ölkənin müəllim yetişdirən əsas təhsil ocağıdır.

Universitetin Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov ADPU-da həyata keçirilən yenilikləri diqqətə çatdıraraq deyiblər ki, bu il universitetə qəbul olunan tələbələrin 566 nəfəri 500-dən yuxarı bal toplayıb. Bu, müəllimlik peşəsinin nüfuzunun artmasının və ölkədə təhsil sahəsində aparılan islahatların nəticəsidir.

Təhsil Nazirliyinin media ilə əlaqələrə xüsusi önəm verdiyini deyən nazirliyin sektor müdiri Cəsarət Valehov isə "Media və təhsil dialoqu" mövzusunda təlim-konfransın artıq altıncı dəfə keçirildiyini diqqətə çatdırıb. Sektor müdiri bildirib ki, tədbirin keçirilməsində məqsəd ali təhsil müəssisələrinin media ilə əlaqələrinin möhkəmləndirilməsi, ictimaiyyətlə əlaqələr üzrə peşəkar vərdişlərin artırılması, universitetlərin veb saytlarının müasir standartlara uyğunlaşdırılması və əlçatanlığın təmin olunmasıdır.

Daha sonra Qlazqo Universitetinin məzunu və Qərbi Kaspi Universitetinin Sosial elmlər kafedrasının müəllimi Samirə Həsənzadənin "Universitet veb saytının istifadəçilər üçün əlçatanlığının təmin olunması", Təhsil Nazirliyinin sosial media üzrə marketinq meneceri İsfəndiyar Əmrahovun "Ali təhsil müəssisələrinin rəqəmsal alətlərdən istifadəsi və onların nəticələri", Təhsil Nazirliyinin vebmasteri Mehman Şəfaqətovun "Veb saytlarda yeni funksiyalardan səmərəli istifadə və təhlükəsizlik" mövzularında təqdimatları olub.

Tədbir təqdimatlar ətrafında müzakirələrlə davam edib.

Tədbirdə çıxış edən "525-ci qəzet"in baş redaktoru Rəşad Məcid, "Yeni Müsavat" qəzetinin baş redaktoru Rauf Arifoğlu, "Ayna.az" saytının rəhbəri Elçin Şıxlı, "Olaylar" İnformasiya Agentliyinin baş direktoru Yunus Oğuz, təhsil eksperti Etibar Əliyev, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin İctimaiyyətlə əlaqələr sektorunun müdiri Bəşarət Məmmədov təhsil-media əlaqələrinin daha da gücləndirilməsi barədə fikirlərini bölüşüblər. Bildiriblər ki, belə təlim-konfranslar Təhsil Nazirliyinin ictimaiyyətlə əlaqələrinin açıqlığına daha bir sübutdur. Çıxış edənlər ali məktəblərin piar işinin daha da təkmilləşdirilməsi, növbəti təlim-konfransların kollec və orta məktəblərdə təşkil edilməsinə dair təkliflər irəli sürüblər.

Tədbirdə həmçinin yeni məzmun, forma və tərtibatda çap olunan "Azərbaycan məktəbi" jurnalı konfrans iştirakçılarına təqdim edilib.

# Müəllimlərin işə qəbulu prosesi ilə bağlı seminar

Dekabrın 19-da Təhsil Nazirliyinin İnsan Resursları Mərkəzi tərəfindən Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) maarifləndirmə məqsədilə dövlət ümumi təhsil müəssisələrinə müəllimlərin işə qəbulu prosesi ilə bağlı seminar keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyinə təmsil olunan məsul şəxslər, fakültə dekanları, kafedra müdirləri və IV tədris ilinin tələbələri iştirak ediblər.





Tədbiri giriş sözü ilə açan Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov qeyd edib ki, bugünkü seminarın keçirilməsində məqsəd ümumi təhsil müəssisələrinə müəllimlərin işə qəbulu qaydaları, müsabiqənin mərhələləri barədə ətraflı məlumat vermək, ali təhsil müəssisəsinin sonuncu tədris ilində pedaqoji profilli ixtisaslar üzrə təhsil alan tələbələri sözügedən müsabiqədə iştiraka təşviq etməkdir.ADPU ölkəmizdə müəllim hazırlığının mərkəzi hesab edilir. Son illər Azərbaycan cəmiyyətində müəllim peşəsinin ictimai nüfuzu yüksəlib, bu peşəyə maraq xeyli artıb. Sevindirici haldır ki, son illər 500-dən yüksək bal toplayan çoxlu sayda gənc müəllimlik peşəsini seçir. Dosent E.Aslanov çıxışının sonunda seminarın keçirilməsinə görə Təhsil Nazirliyinin rəhbərliyinə təşəkkür edib və iştirakçılara uğurlar arzulayıb.

Seminarda İnsan Resursları Mərkəzinin baş mütəxəssisləri Elçin Abıyev, Suqra Quliyeva, Əli Qocalı, Nərmin Quliyeva və Aylan Məmmədova təqdimatlar ediblər. Tələbələrə İnsan Resursları Mərkəzinin fəaliyyətini əks etdirən bukletlər paylanılıb.Seminarda həmçinin müəllimlərin işə qəbulu ilə əlaqədar qanunvericiliklə bağlı məlumat verilib və müəllimlərin sosial rifahının yüksəldilməsi istiqamətində görülən tədbirlərin əhəmiyyəti qeyd olunub.

Seminarda ADPU-nun məzunları olan və Müəllimlərin İşə Qəbulu Müsabiqəsində (MİQ) 59 bal toplayaraq Bakı şəhəri 20 nömrəli tam orta məktəbə "İbtidai sinif müəllimliyi"ixtisası üzrə işə qəbul edilmiş Xəyalə Hüseynli, 59 bal toplayaraq Bakı şəhəri 102 nömrəli tam orta məktəbə "Coğrafiya müəllimliyi" ixtisası üzrə işə qəbul edilmiş İdris Abıyev, 55 bal toplayaraq Bakı şəhəri 27 nömrəli tam orta məktəbə "İnformatika müəllimliyi" ixtisası üzrə işə qəbul edilmiş Elvin Səlimov çıxış edərək müsabiqənin şəffaf və obyektiv keçirilməsindən razı qaldıqlarını bildiriblər.



Sonda tələbələrin sualları cavablandırılıb.

# Professor Əzizxan Tanrıverdinin xatirəsinə həsr edilmiş tədbir

**Dekabrın 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) görkəmli dilçi alim, Filologiya fakültəsinin Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının sabiq müdiri, filologiya üzrə elmlər doktoru, professor Əzizxan Tanrıverdinin xatirəsinə həsr edilmiş tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, ölkəmizin tanınmış, nüfuzlu ziyalıları və Filologiya fakültənin əməkdaşları, fakültə dekanları iştirak ediblər. Tədbirdən öncə iştirakçılar professor Əzizxan Tanrıverdinin əsərləri ilə tanış olublar.**



Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov qeyd edib ki, biz bu gün universitetimizin çox dəyərli bir aliminin- professor Əzizxan Tanrıverdinin xatirəsini anmaq üçün toplaşmışıq. Professor Əzizxan Tanrıverdi ADPU-da həyata keçirilən islahatlarda, yeniliklərdə, insan resurslarının inkişaf etdirilməsində, layiqli mütəxəssislərin işə cəlb edilməsində fəal iştirak edib. Sözübütöv, əqidəli, prinsipial şəxsiyyət idi. Onun rəhbərlik etdiyi kafedra universitetimizin tanınan, sayılıb-seçilən kafedralarından biridir. Professor Əzizxan Tanrıverdi kafedranı uğurla idarə edirdi. Kollektivdə sevilən, hörmət edilən bir ziyalı idi.

Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının müdiri, filologiya üzrə elmlər doktoru Kamil Bəşirov professor Əzizxan Tanrıverdinin həyat və fəaliyyəti haqqında məruzə ilə çıxış edib. Qeyd edib ki, Əzizxan Tanrıverdi 1959-cu il yanvar ayının 1-də Gürcüstan Respublikasının Dmanisi rayonunun Aşağı Qarabulaq kəndində anadan olub. 1973-cü ildə Aşağı Qarabulaq kənd səkkizillik, 1975-ci ildə isə Kirovisi kənd orta məktəbini əla qiymətlərlə bitirib. 1975-1977-ci illərdə Dmanisi rayonunun Eqrisi sovxozunda fəhlə işləyib. 1977-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU) Filologiya fakültəsinə qəbul olunub. Tələbəlik illərində Cəfər Cabbarlı adına təqaüdlə oxuyub. 1981-ci ildə ADPU-nu fərqlənmə diplomu ilə bitirib. 1985-ci ildə ADPU-nun aspiranturasının əyani şöbəsinə qəbul olunub. 1987-ci ildə aspiranturanı bitirərək “XVII-XIX əsr Azərbaycan antroponimləri” mövzusunda namizədlik dissertasiyası müdafiə edərək filologiya elmləri namizədi elmi dərəcəsi alıb. 1989-cu ildə Özbəkistanda keçirilmiş onomastika konfransında iştirak edib. 1998-ci ildə “Türk mənşəli Azərbaycan antroponimlərinin tarixi-linqvistik tədqiqi” mövzusunda doktorluq dissertasiyasını müdafiə edərək filologiya elmləri doktoru elmi dərəcəsi alıb.

ADPU-nun Azərbaycan dilçiliyi kafedrasında laborant (1987), baş laborant (1988), müəllim (1990), baş müəllim (1992), dosent (1994), professor (1999) vəzifələrində işləyib. 2011-ci il sentyabr ayının 30-da Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının müdiri təyin edilib. 30 kitabın, 8 proqramın, 250-dən çox tezis və məqalənin müəllifidir. Onun elmi rəhbərliyi ilə 3 nəfər fəlsəfə doktoru dissertasiyası müdafiə edib. 19 fəlsəfə doktoru, 4 doktorluq dissertasiyasına opponentlik edib, müxtəlif kitabların elmi məsləhətçisi olub. 100-dən çox dərslik və monoqrafiyanın rəyçisi və redaktoru olub. “Azərbaycan dilinin tarixi qrammatikası” (Bakı-2010) dərsliyi respublikamızın müvafiq ali məktəblərinin filologiya fakültələrində əsas dərslik kimi istifadə olunur. 2007-2016-cı illərdə Azərbaycan Milli Elmlər Akademiyasının Folklor İnstitutunda baş elmi işçi vəzifəsində işləyib.

2003-2005-ci illərdə Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının filologiya elmləri üzrə eksperti kimi fəaliyyət göstərib. 2007-2009-cu illərdə Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutunun (indiki Azərbaycan Respublikasının Təhsil İnstitutu) pedaqoji elmlər üzrə Dissertasiya Şurasının, 2011-ci ildən isə ADPU-nun pedaqoji elmlər üzrə fəaliyyət göstərən Dissertasiya Şurasının üzvü olub.

7-10 oktyabr 2014-cü ildə TÜRKSOY-un xətti ilə Qazaxıstan Respublikasının Qızılorda şəhərində “Dədə Qorqud türk xalqlarının sələfidir” mövzusunda keçirilmiş beynəlxalq konfransda “Kitabi-Dədə Qorqud” türk xalqlarının ortaq abidəsi kimi” adlı məruzə ilə çıxış edib. Həmin çıxışına görə “Türk Dünyasının ulu atası Korkut”medalı ilə təltif edilib. 2015-ci ilin fevral ayından Azərbaycan Yazıçılar Birliyinin üzvü olub. Professor Əzizxan Tanrıverdinin elmi-pedaqoji fəaliyyəti haqqında müxtəlif əsərlər və məqalələr çap olunub. Əsərləri rus, ingilis, türk, qazax və digər dillərdə çap edilib. Professor Əzizxan Tanrıverdi sadəliyi, səmimiyyəti, təvazökarlığı, xeyirxahlığı, nəcibliyi ilə ADPU kollektivinin böyük hörmətini qazanmışdı. Övladlarını cəmiyyət üçün layiqli vətəndaşlar kimi yetişdirib. Gözəl ailə başçısı, qayğıkeş ata idi.

Professor Əzizxan Tanrıverdi 2018-ci il iyul ayının 19-da 59 yaşında vəfat edib. Əzizxan Tanrıverdinin xatirəsi onu tanıyanların qəlbində həmişə yaşayacaqdır.

Tədbirdə çıxış edən millət vəkili, akademik Nizami Cəfərov, professor Fərrux Rüstəmov, professor Sayalı Sadıqova, professor Vilayət Əliyev, professor Zahid Xəlil, professor Elman Quliyev, professor Təyyar Salamoğlu Əzizxan Tanrıverdinin çox gözəl yaddaşa, yüksək intellekt səviyyəsinə, geniş dünyagörüşünə, zəngin mənəviyyata

malik ziyalı olduğunu vurğulayaraq onunla bağlı xatirələrini bölüşüblər.

Sonda Əzizxan Tanrıverdinin oğlu Rəşad Tanrıverdi çıxış edərək atasının xatirəsinə göstərilən hörmət və ehtirama görə ADPU-nun rəhbərliyinə, həmçinin tədbirin ərsəyə gəlməsində əməyi keçən hər kəsə təşəkkür edib.

**Nurlan Səmədov**

# “İnnovasiya, təhsilin keyfiyyəti və inkişaf” IV Beynəlxalq elmi konfransı

**Azərbaycan Respublikasının Təhsil Nazirliyinin dəstəyi ilə Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) Ukrayna Təhsil Menecerləri Universiteti və Başkir Dövlət Pedaqoji Universiteti ilə birgə dekabrın 20-21-də “İnnovasiya, təhsilin keyfiyyəti və inkişaf” IV Beynəlxalq elmi konfransı keçirib. Məlumat üçün bildirək ki, bu beynəlxalq elmi konfransın yüksək səviyyədə keçirilməsi üçün ADPU-nun rektoru, professor Cəfər Cəfərov müvafiq əmr imzalayıb və həmin əmrə əsasən universitetdə 12 nəfərdən ibarət Lokal Təşkilat Komitəsi yaradılıb. Konfransda Azər-**




**baycan Milli Elmlər Akademiyasının (AMEA) müvafiq elmi-tədqiqat institutlarının, Təhsil İnstitutunun, Rusiyanın, Ukraynanın, İsveçin ali təhsil müəssisələrinin və elmi-tədqiqat mərkəzlərinin alim-mütəxəssisləri iştirak ediblər. Konfransda əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.**

Konfransın plenar iclasını giriş sözü ilə açan rektor Cəfər Cəfərov konfrans iştirakçılarını təbrik edib və onlara uğurlar arzulayıb. Rektor bildirib ki, ADPU təhsilin inkişafı üçün elmi-tədqiqatların aparılmasına, müxtəlif ciddi və yüksək səviyyəli elmi tədbirlərin, o cümlədən beynəlxalq elmi konfransların, simpoziumların keçirilməsinə xüsusi önəm verir. Çünki belə elmi konfranslar fəaliyyətimizə kömək edir, bizi qarşımıza qoyduğumuz hədəf və məqsədlərə yaxınlaşdırır. Konfransdan çıxarılan elmi nəticələrin əməli fəaliyyətə tətbiq edilməsi olduqca vacibdir.

Çıxışında müəllim hazırlığının yeni trendləri barədə danışan rektor qeyd edib ki, Azərbaycan Müəllimlərinin XV Qurultayı müəllim hazırlığı sahəsində qarşımıza mühüm vəzifələr qoyub. Təhsil strateji fəaliyyət sahəsi, müəllim hazırlığı isə ölkəmizin milli təhlükəsizliyi məsələsidir. 2021-ci ildə 100 illik yubileyini qeyd edəcək Pedaqoji Universitet “ADPU-2021 Strateji İnkişaf Planı”nda öz missiyasını pedaqoji sahədə təhsil və tədqiqatın əsas mərkəzi olmaq kimi ifadə edib. ADPU təhsil-tədqiqat-innovasiya mərkəzinə çevrilməli, tədqiqat universiteti statusunu qazanmalıdır. Elm və təhsilin sürətlə inkişaf etdiyi XXI əsrdə bu çox vacibdir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin həyata keçirdiyi davamlı inkişaf siyasəti, elm və təhsilə göstərdiyi xüsusi diqqət və qayğı, Birinci vitse-prezident Mehriban xanım Əliyevanın bu işləri şəxsi nəzarətində saxlaması təhsil ictimaiyyətinə geniş imkanlar yaradır. Məhz bu diqqət və qayğının nəticəsində son 5 ildə pedaqoji kadr hazırlığında, müəllimlik peşəsinə maraqda ciddi şəkildə müsbət dəyişiklər yaşanır. 2016-2017-ci tədris ilində 500-dən yüksək bal toplayıb müəllimlik peşəsini 1-ci yerdə seçən abituriyentlərin sayı 25 nəfər olduğu halda, 2018-2019-cu tədris ilində müəllimlik peşəsini seçənlərin sayı ölkə üzrə 2090 nəfər, ADPU üzrə isə 566 nəfər nəfər ol-






muşdur. Bu, Pedaqoji Universitetin timsalında nəticənin 22 dəfə yaxşılaşması deməkdir. Bu gün ölkəmizdə təhsil sahəsində islahatlar geniş miqyasda və sürətlə həyata keçirilir. Ali təhsil sistemi yeni inkişaf mərhələsindədir. Müasir dövrümüzün tələblərinə görə, ali təhsil də xidmət sahəsi hesab edilir. Bizim Pedaqoji Universitet olaraq əsas vəzifəmiz müasir müəllim şəxsiyyətini formalaşdırmaq, cəmiyyətdə müəllim peşəsinə olan inamın və etibarın yüksəldilməsi üçün yeni dövrün tələblərinə uyğun bilik və bacarıqlara malik müəllimlər yetişdirməkdir.

İclasda çıxış edən Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov vurğulayıb ki, dünyanın tanınmış və nüfuzlu universitetləri qabaqcıl elmi texnologiyaların araşdırılmasına, beynəlxalq elmi tutumlu layihələrdə iştirak etməyə böyük diqqət yetirirlər. İnnovasiyaların sürətlə tətbiqi zamanın tələbidir. ADPU elmi layihələrdə fəal iştirak etmək üçün səmərəli fəaliyyət göstərir. 2018-ci ildə universitetimiz Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun 5 qrant layihəsini qazanıb. Bu il ADPU 25-dən çox respublika və beynəlxalq səviyyəli konfrans keçirib. Professor A.Zamanov çıxışının sonunda konfransın işinə uğurlar arzulayıb.

İclasda konfransın Lokal Təşkilat Komitəsinə ünvanlanmış təbriklər dinlənilib.

İclasda Moskva Pedaqoji Dövlət Universitetinin kafedra müdiri, professor Lüdmila Podımova “Müasir təhsilin psixoloji xüsusiyyətləri: koqnitiv və şəxsiyyətyönümlü kontekstlər” mövzusunda, ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov “Pedaqoji sistemlərin təkmilləşdirilməsində innovasiyaların rolu” mövzusunda məruzələrlə çıxış ediblər. Məruzələr iştirakçılar tərəfindən maraqla qarşılanıb.

Sonra konfrans öz işini 5 bölmədə- Təhsilin idarə edilməsi: reallıqlar və perspektivlər, İnnovasiyalar və ənənələr: təhsilin keyfiyyəti, Təhsilin keyfiyyətinin qiymətləndirilməsinin metodologiyası və texnologiyası, Təhsilin keyfiyyətinin modernləşdirilməsinin psixoloji və sosial-iqtisadi aspektləri, Tədrisin müasir problemləri bölmələrində davam etdirib.

Bölmə iclaslarında ümumilikdə 200-dək məruzə dinlənilib və müzakirələr aparılıb.

Qeyd edək ki, 2 gün davam edən beynəlxalq elmi konfransın dekabrın 21-də keçirilmiş yekun iclasında bölmə rəhbərlərinin hesabatları dinlənilib, ümumi müzakirələr aparılıb, təkliflər irəli sürülüb və müvafiq qərarlar qəbul edilib.

**Günay Bağırlı**

# 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Gününə və Yeni ilə həsr olunmuş bayram tədbiri

Dekabrın 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Həmkarlar İttifaqı Komitəsinin (THİK) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsi üzrə təşkilatının təşəbbüsü və təşkilatçılığı ilə 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Gününə və 2019-cu ilin gəlişinə həsr olunmuş bayram tədbiri keçirilib. Tədbir rəsmi və bədii hissədən ibarət olub. Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlanıb.




ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək universitetin kollektivini 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə təbrik edib, həyatda və təhsildə uğurlar arzulayıb. Rektor çıxışında Azərbaycan xalqının mübarizə ruhundan, qələbə əzmindən danışıb. Ümummilli liderimiz Heydər Əliyevin və Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin xalqımızın həmrəyliyi, tariximizin, milli-mədəni irsimizin dünyada tanınması yolunda həyata keçirdikləri böyük işləri diqqətə çatdırıb.

Tədbirdə 24 dekabr tarixinin möhtərəm Prezidentimiz İlham Əliyevin doğum günü olması xüsusi vurğulanıb, ADPU-nun rəhbərliyi, müəllim və tələbə kollektivi adından dövlət başçımıza uzun ömür, cansağlığı, ali dövləti fəaliyyətində yeni-yeni uğurlar arzu edilib.

Tədbirin bədii hissəsində isə tələbə-gənclərin hazırladıqları musiqili kompozisiyalar, rəqslər və ifalar, Şuşa Humanitar Kollecinin Xalq çalğı alətləri ansamblının bir-birindən gözəl ifaları, tanınmış müğənnilərin, məşhur rəqs qruplarının, Şaxta baba və Qar qızın çıxışları yer alıb. Bədii hissədə həmçinin THİK-in təşkilatçılığı ilə keçirilən ”ADPU SƏS” müsabiqəsinin 3-cü mövsümünün qaliblərinin ifası və mükafatlandırılması gerçəkləşib. Qeyd edək ki, müsabiqəyə Bank of Baku sponsorluq edib. Bankın əməkdaşları tərəfindən mükafatlar I yerin qalibi Leyla Həbibzadəyə, II yerin qalibi Minayə Novruzovaya və III yerin qalibi Nərgiz Kərimovaya təqdim olunub. Tədbir hamıda yüksək əhvali-ruhiyyə yaradıb.



# Elmi Şuranın iclası

**Dekabrın 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq bildirib ki, iclasın gündəliyinə "2018-2019-cu tədris ilinin payız semestrinin imtahan sessiyasına hazırlığın vəziyyəti haqqında", "ADPU-da professor-müəllim heyətinin, kafedra və fakültələrin illik fəaliyyətinin Reytinq Qiymətləndirməsinin ilkin nəticələri haqqında" və cari məsələlər daxildir.**



İclasa başlamazdan öncə rektor Cəfər Cəfərov filologiya üzrə elmlər doktoru, professor Buludxan Xəlilova Filologiya fakültəsinin inkişafında xidmətlərinə görə, Musiqi və onun tədrisi metodikası kafedrasının professoru Minarə Dadaşovaya, İnsan və heyvan fiziologiyası kafedrasının professoru Məmməd Qarayevə, Fəlsəfə və sosial fənlər kafedrasının dosenti Yasin Qaraməmmədliyə, Ümumi pedaqogika kafedrasının dosenti Miri Həsənova, Riyazi analiz kafedrasının dosenti Kamandar Cəfərova universitetdə uzun illər elmi-pedaqoji fəaliyyətlərinə görə və yubileyləri münasibətilə fəxri fərmanlar təqdim edib. ADPU-nun Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev professor Minarə Dadaşovaya, professor Məmməd Qarayevə, dosent Yasin Qaraməmmədliyə, dosent Miri Həsənova, dosent Kamandar Cəfərova gənc nəslin təlim-tərbiyəsində xidmətlərinə görə Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin sədri Səttar Mehbalıyevin imzaladığı fəxri fərmanları təqdim edib.

İclasda həmçinin Riyazi analiz kafedrasının müdiri Bəhram Əliyevə professor attestatı təqdim edilib.

Rektor çıxışında qeyd edib ki, artıq tədris ilinin birinci yarım ili başa çatır. Tədris ilinin birinci yarım ilinin nəticələri kollektivimiz üçün çox uğurlu olub. Tələbə qəbulunun nəticələri yaxşılaşıb, kəmiyyət və keyfiyyət göstəriciləri yüksəlib. Bu dövrdə universitetdə yüksək səviyyədə keçirilən tədbirlərdən ulu öndər Heydər Əliyevin 95 illik yubileyinə və Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinə həsr edilmiş silsilə tədbirləri, 5 Oktyabr-Beynəlxalq Müəllimlər Gününə həsr edilmiş tədbiri, Doktorantların və gənc tədqiqatçıların XXII Respublika elmi konfransını, ADPU-nun nümayəndələrinin Azərbaycan Müəllimlərinin XV Qurultayındakı fəal iştirakını, "İnnovasiya, təhsilin keyfiyyəti və inkişaf" IV Beynəlxalq elmi konfransı xüsusi qeyd etmək olar. "ADPU-nun 2018-2021-ci illər üzrə Strateji İnkişaf Planı", 2018-2019-cu tədris ili üçün iş planı, struktur bölmələrin əsasnamələri və iş planları hazırlanaraq təsdiq edilib. Professor-müəllim heyətinin, kafedra və fakültələrin illik fəaliyyətinin reytinq qiymətləndirməsinə, fakültələrdə yeni tədris planlarının işlənilməsinə başlanılıb. ADPU-nun professor-müəllimləri Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun 5 qrant layihəsini, tələbə-gəncləri isə Azərbaycan Respublikasının Gənclər Fondunun 6 qrant layihəsini qazanıblar. Azərbaycan Milli Elmlər Akademiyasının prezidenti olmuş ADPU-nun 3 məzununun adlarını daşıyan auditoriaların açılışı, Heydər Əliyev Fondunun dəstəyi ilə 1 nömrəli inzibati-tədris korpusunun 14 mərtəbəli binasının fasadının üzlənməsi, Filologiya fakültəsinin fəaliyyət göstərdiyi mərtəbənin təmiri həyata keçirilib. Qarşıdan payız semestrinin imtahan sessiyası gəlir. Biz imtahan sessiyasının mütəşəkkil, şəffaf və obyektiv keçirilməsini təmin etməliyik.

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov"2018-2019-cu tədris ilinin payız semestrinin imtahan sessiyasına hazırlığın vəziyyəti haqqında" məruzə ilə çıxış edib. Dosent E. Aslanov bildirib ki, 2018-2019-cu tədris ilinin payız semestrinin imtahan sessiyası 2019-cu ilin yanvar ayının 4-dən fevral ayının 2-dək tərtib olunmuş cədvəl üzrə keçiriləcək. Hazırda son kollokviumlar keçirilir. Dərslər öncədən müəyyən edilmiş qrafikə uyğun keçirilib. Müəllimlərin dərs davamiyyəti gündəlik yoxlanılıb və müvafiq qeydlər aparılıb. Müəllimlərin dərsə davamiyyəti haqqında yarımillik nəticələr hazırlanır və onların müzakirə olunması nəzərdə tutulur. İmtahanlar ali təhsilin bakalavriat səviyyəsində I-III tədris ili tələbələri üçün yazılı formada, IV və əvvəlki illərdən olan tələbələr üçün isə spesifik fənlər istisna olmaqla, kompüter vasitəsilə test üsulu formasında, magistratura səviyyəsində isə yazılı şəkildə keçiriləcək. Payız semestrinin imtahanları və dövlət imtahanları Tədris Departamentinin İmtahan və monitorinq şöbəsi tərəfindən idarə olunacaq. Semestr və həmçinin dövlət imtahanlarında mütəşəkkilliyin təmin olunması məqsədilə Tədris Departamentinin ümumi təşkilatçılığı və koordinatorluğu ilə universitet üzrə 30 nəfər imtahan təşkilatçısı, o cümlədən 100-dək nəzarətçidən ibarət İmtahan İdarəetmə Qrupu yaradılıb və bütün imtahanların təşkili və imtahanlarla əlaqəli bütün funksiyaların icra edilməsi bu qrupa həvalə edilib. Şəffaflığın və obyektivliyin təmin edilməsi üçün rektora və prorektorlara e-poçtla birbaşa müraciət etmək, qəbula yazılmaq, İctimai Şuraya müraciət etmək, qaynarxett@adpu.edu.az və ADPU-nun rəsmi facebook səhifəsindən inboksa yazmaq, Tələbə Gənclər Təşkilatının xətti ilə tələbələrin rəylərinin öyrənilməsi, İmtahan Qərargahına və Apelyasiya Komissiyasına müraciət etmək imkanları təmin ediləcək, dekanlıqlara tələbələrin qəbulları təşkil ediləcək.

Elmi Şura dosent E. Aslanovun hesabatını qəbul edib.

"ADPU-da professor-müəllim heyətinin, kafedra və fakültələrin illik fəaliyyətinin Reytinq Qiymətləndirməsinin ilkin nəticələri haqqında" Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov məlumat verib. Rəşad Sadıqov qeyd edib ki, keyfiyyətin artırılmasında mühüm rol oynayacaq Reytinq Qiymətləndirməsinin tətbiqinin məqsədi universitetin, o cümlədən fakültə və kafedraların fəaliyyətinin müasir dövrdə ali təhsil müəssisələri qarşısında qoyulan milli və beynəlxalq tələblərə uyğunlaşdırılması, professor-müəllim heyətinin, kafedraların və fakültələrin mövcud pedaqoji, elmi-tədqiqat və ictimai fəaliyyətinin vəziyyətinin və səviyyəsinin vahid meyarlar əsasında qiymətləndirilməsi, fakültələrin və kafedraların resurslarının, tədris işinin təşkilinin və elmi-tədqiqat fəaliyyətinin vəziyyətinin müəyyənləşdirilməsi, professor-müəllim heyətinin, kafedra və fakültələrin tədris prosesinin yaxşılaşdırılmasına fərdi və kollektiv töhfəsini nəzərə almaqla, onların maddi və mənəvi həvəsləndirilməsi, nəticələri ümumiləşdirməklə illik fəaliyyətin dinamikasının izlənilməsidir. Rektor Cəfər Cəfərovun rəhbərliyi ilə dekanların, əksər kafedra müdirlərinin və bir sıra şöbələrin müdirlərinin iştirakı ilə 4 sənədin - "Azərbaycan Dövlət Pedaqoji Universitetində professor-müəllim heyətinin, kafedraların və fakültələrin illik fəaliyyətinin Reytinq Qiymətləndirməsi ilə bağlı Müvəqqəti qaydalar", kafedra üçün nəzərdə tutulmuş cədvəl, fakütə üçün nəzərədə tutulmuş cədvəl, tələbələr üçün qiymətləndirmə sorğusu nümunəsi çox geniş müzakirə olunub, bir sıra qeydlər və təkliflər irəli sürülüb. Həmin müzakirədən təxminən 1 ay əvvəl qeyd olunan sənədlər bütün struktur bölmə rəhbərlərinə tanışlıq və təkliflər bildirilməsi üçün göndərilib. Müzakirə zamanı səsləndirilmiş bütün qeyd və tövsiyələr qeydə alınıb və sənədlərin təkmilləşdirilməsində istifadə edilib. Sözügedən sənədlərin daha da təkmilləşdirilmiş variantı yenidən qeyd olunan ünvanlara göndərilib. Sənədlərin ən son vəziyyəti ilə bağlı irəli sürülmüş bir neçə təklif dəyərləndirilərək uyğun olanları tətbiq edilib. Sentyabrın 14-də Elmi Şuranın iclasında Reytinq Qiymətləndirməsi ilə bağlı bütün sənədlər təsdiq edilib. Reytinq Qiymətləndirməsi 8 fakültədə 760 nəfər iştirakçı arasında keçirilib. Professor-müəllim heyətinin, kafedraların və fakültələrin illik fəaliyyətinin Reytinq Qiymətləndirməsi ilə bağlı təsdiq edilmiş sənədlərin bütün fakültələrdə oktyabr-noyabr aylarında geniş təqdimatları keçirilib. Təqdimatlar Elmi Şuranın qərarına əsasən dekanlıqların təşkilatçılığı ilə Keyfiyyətin təminatı şöbəsi tərəfindən keçirilib. Hər bir fakültədə keçirilmiş təqdimatlarda fakültə rəhbərliyi, müəllimlər və tədris-köməkçi heyətin nümayəndələri iştirak ediblər. Keçirilmiş təqdimatlar ADPU-nun rəsmi saytında yerləşdirilib və facebook səhifəsində paylaşılıb.Tələbələr arasında qiymətləndirmə ilə bağlı sorğu aparılıb. Təqdim edilmiş bütün sənədlərin həqiqiliyi və düzgünlüyü araşdırılıb. Aşkar edilmiş çatışmazlıqlarla bağlı müvafiq kafedra və dekanlıqlara məlumat verilib. R.Sadıqov çıxışının sonunda Reytinq Qiymətləndirməsinin təkmilləşdirilməsi ilə bağlı təkliflər irəli sürüb.

Professor Nizami Xudiyev, professor Minarə Dadaşova, professor Nailə Verdizadə, professor Bəhram Əliyev, dosent Şahin Pənahov, dosent Arzu Daşdəmirov, dosent Əli Zalov, dosent Yusif Alıyev çıxış edərək Reytinq Qiymətləndirməsinin təkmilləşdirilməsi ilə bağlı fikir və mülahizələrini bölüşüblər.

Elmi Şura R.Sadıqovun hesabatını qəbul edib.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov cari məsələlər barədə məlumat verib. Professor A.Zamanov ADPU-da 20-21 dekabr 2018-ci il tarixlərində keçirilən "İnnovasiya, təhsilin keyfiyyəti və inkişaf" IV Beynəlxalq elmi konfransın yekunları barədə, 2018-ci il üçün fəlsəfə doktoru proqramı üzrə doktoranturaya və dissertanturaya, elmlər doktoru proqramı üzrə dissertanturaya qəbulun nəticələri barədə məlumat verib.

Cari məsələlərdə həmçinin Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev adlı fərdi təqaüdlərin aylıq məbləğinin müəyyən edilməsi haqqında, Elmi katib, siyasi elmlər üzrə fəlsəfə doktoru Asif Axundov professor və dosent elmi adlarının verilməsi üçün Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının qarşısında vəsatət qaldırılması barədə məlumat veriblər.

Cari məsələlər müzakirə olunub və müvafiq qərarlar qəbul edilib.

Sonda rektor Cəfər Cəfərov Elmi Şura üzvlərini qarşıdan gələn 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə təbrik edib, onlara uğurlar arzulayıb.

**Könül Nəzərova**

# Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsində Tir-atıcılıq otağının açılışı və sərgilər keçirilib

Dekabrın 26-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsində Tir-atıcılıq otağının açılışı, Təsviri incəsənət və onun tədrisi metodikası kafedrasının müəllimi Vəfa Allahyarovanın müxtəlif bədii əsərlərə verdiyi illüstrasiya sərgisi, fakültənin tələbələrinin əl işlərindən ibarət rəsm sərgisi, həmçinin Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinə həsr olunmuş plakat sərgisi keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültənin müəllim və tələbələri iştirak ediblər.



Öncə ADPU-nun rektoru, professor Cəfər Cəfərov Tir-atıcılıq otağı ilə tanış olub. Sonra sərgilərə baxış keçirilib. Sərgilər iştirakçıların böyük marağına səbəb olub.

Daha sonra fakültə tələbələrinin "Kainat" və "Mənim sevimli oyuncağım" mövzularında açıq dərsləri izlənilib. "Kainat" açıq dərsində rektor Cəfər Cəfərov futzal üzrə respublikamızın ali təhsil müəssisələrinin komandaları arasında keçirilmiş respublika çempionatında fakültənin II yeri tutan komandasının üzvlərinə və həmçinin universitetin Tələbə Elmi Cəmiyyətinin xətti ilə keçirilən yekun konfransda fəal iştirakına görə fərqlənən tələbələrə təşəkkürnamələr təqdim edib.

Sonda "Musiqi müəllimliyi" ixtisasında təhsil alan tələbələr konsert proqramı ilə çıxış ediblər.

# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində "Ana dilimizi qoruyaq!" adlı tədbir

**Dekabrın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində "Ana dilimizi qoruyaq!" adlı tədbir keçirilib. Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlayıb.**



Giriş sözü ilə çıxış edən fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva ana dilimizin gözəlliyini, zənginliyini vurğulayaraq, ana dilimizə dövlət səviyyəsində göstərilən diqqət və qayğıdan söz açıb, doğma dilimizin qorunmasına xidmət edən hüquqi-normativ sənədlərdən danışıb, tələbələrin diqqətini bir daha bu mövzuya yönəldib.

Ulu öndərimiz Heydər Əliyevin ana dilimiz haqqında tarixi çıxışı və iflasında dinlənilən "Azərbaycan" şeiri tədbirə xüsusi ahəng verib. Bəxtiyar Vahabzadənin ifasında səslənən "Ana dilim" şeiri, Konstantin Uşinskinin, Yan Komenskinin, Firudin bəy Köçərlinin, Mirzə Fətəli Axundzadənin, Cəlil Məmmədquluzadənin və digər dahi mütəfəkkirlərin ana dili haqqında qiymətli fikirlərindən ibarət videoçarxların göstərilməsi də təqdirəlayiq idi. "Ana dilim şirindir", "Azərbaycan" mahnıları tədbirə şux ovqat qatıb. Tələbələr tərəfindən ifa olunan səhnəciklərdə isə müasir azərbaycanlı ailəsində ana dilimizin qorunub saxlanılmasının nə qədər əhəmiyyətli olduğu əks etdirilib. Bəxtiyar Vahabzadənin, Xəlil Rza Ulutürkün, Tofiq Bayramın şeirləri səsləndirilib, müxtəlif videoçarxlar nümayiş edilib. Tələbə M.İlahənin ifa etdiyi "Sarı gəlin" mahnısı, B.Xalidənin lay-lay ilə müşayiət edilən "Mənim dilim" şeiri çox bəyənilib. Tələbələrdən M.Nərmin, A.Kənan, N.Nurlanın çıxışları maraqla qarşılanıb.

Filologiya fakültəsinin Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının müəllimi İlkin Əliyevin çıxışında mövzu barədə maraqlı və aktual məqamlara toxunması diqqəti çəkib.

Sonda professor Müseyib İlyasov tədbir haqqında fikirlərini bölüşərək tələbələrə dəyərli tövsiyələr verib, ana dilimizi qorumağın hər birimizin müqəddəs borcu olduğunu vurğulayıb.

Qeyd edək ki, tədbiri Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının müəllimi Sona Abdulova "Məktəbəqədər təlim və tərbiyə" ixtisasının tələbələri ilə birgə hazırlayıb.

## Fizika və texnologiya fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası



Dekabrın 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası keçirilib. İclasın gündəliyinə fakültənin Tədris-Metodiki Şurası (TMŞ) sədrinin hesabatı, payız semestrinin imtahan sessiyasına hazırlığın vəziyyəti, fakültə elmi seminar rəhbərinin hesabatı, kafedralarda yerinə yetirilən elmi-tədqiqat işlərinin yekunu haqqında hesabat, fakültədə təlim-tərbiyə işlərinin vəziyyətinin yüksəldilməsi və cari məsələ daxil edilib.

İclasa başlamazdan öncə fakültənin dekanı, fakültə Elmi Şurasının sədri, dosent Arzu Daşdəmirov, Elmi Şuranın üzvləri-professor Edil Eyvazov, professor Vaqif Nəsirov, dosent Cahangir Hüseynov, dosent Aydın Ələkbərov, dosent Namiq Niftiyev, dosent Sevinc Cəlilova, dosent Xatirə Adıgözəlova, dosent Səadət Musayeva fakültə Tələbə Elmi Cəmiyyətinin keçirdiyi “Gələcəyə addım” II Elmi konfransının iştirakçılarına sertifikatlar təqdim ediblər.



1-ci məsələ ilə bağlı fakültə TMŞ-nin sədri, professor Həmzə Seyidlinin hesabatı dinlənilib. Professor H.Seyidli son bir il ərzində TMŞ-nın gördüyü işlər haqqında geniş məlumat verərək bildirib ki, bu müddət ərzində TMŞ-nin üzvləri müəllimlərin dərslərində iştirak edib, dərslərin qiymətləndirilməsi aparılıb, metodiki tövsiyələr verilib. Fakültədə tədris olunan fənlərin müvafiq kafedralar üzrə dərs yüklərinin bölgüsü, onların dövlət standartlarına uyğunluğu, dərslik təminatı araşdırılıb.

Hesabatla bağlı fakültənin müəllimləri-professor E.Eyvazov, professor V.Nəsirov, professor Ş.Əlizadə və başqaları çıxış edib, fakültədə hesabat ilində görülən işlərin qənaətbəxş qiymətləndirilməsini təklif ediblər.

2-ci məsələ ilə bağlı kafedra müdirləri- dosent C.Hüseynov, dosent S.Musayeva, dosent S.Cəlilova payız semestrinin imtahan sessiyasına hazırlığın vəziyyəti haqqında məlumat veriblər. Fakültənin kafedralarının payız semestrinin imtahan sessiyasına hazırlığının vəziyyəti qənaətbəxş qiymətləndirilib.

3-cü məsələ ilə bağlı fakültə Elmi seminarının rəhbəri, dosent A.Ələkbərovun hesabatı dinlənilib. O, qeyd edib ki, son bir il ərzində fakültəmizdə müxtəlif universitetlərdən məruzəcilər dəvət edilməklə elmi seminarlar keçirilib və bu, mütəmadi olaraq davam etdiriləcək.

4-cü məsələ kafedralarda yerinə yetirilən elmi-tədqiqat işlərinin yekunu haqqında məlumat idi. Bu məsələ ilə bağlı kafedra müdirlərinin elmi işlər üzrə müavinlərinin hesabatları dinlənilib. Onların hesabatlarında il ərzində yerinə yetirilmiş elmi-tədqiqat işlərinin yekunları,bu dövrdə kafedra üzrə xarici və respublika jurnallarında çap olunmuş məqalələrin, dərs və metodik vəsaitlərin, fənn proqramlarının sayı haqqında məlumat verilib.

Cari məsələdə bəzi seçmə fənlər üzrə hazırlanmış proqramlar təsdiq edilib.

Sonda fakültənin dekanı, dosent A.Daşdəmirov fakültənin əməkdaşlarını qarşıdan gələn 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə təbrik edib və uğurlar arzulayıb.

## ADPU-nun tələbələri Anarın “Keçən ilin son gecəsi” əsəri əsasında eyniadlı tamaşa hazırlayıblar



Tamaşanın quruluşçu rejissoru Xalq artisti Ramiz Həsənoğlu, quruluşçu rəssamı Mustafa Mustafayev, prodüseri Pərvin Nurəliyevadır. Gənc Tamaşaçılar Teatrının dəstəyi ilə ərsəyə gələn səhnə əsərində universitetin tələbələri - Samir Canızadə, Eltun Süleymanov, Həmid Yolçiyev, Qərib Əliyev, Əkbər Novruzov, Süleyman Süleymanov, Asiman Quliyeva, Günay Veysəlova, Lamiyə Rzayeva, Miradə Axundova, Aişə Bayramlı, İlahə Rüstəmova, Günel Mahmudova, Gülnar Şərifli rol alıblar. Həmidə xala rolunu Pərvin Nurəliyeva canlandırıb. Tamaşanın premyerası dekabrın 27-də Gənc Tamaşaçılar Teatrında keçirilib.Tamaşanı Azərbaycan Yazıçılar Birliyinin (AYB) sədri, Xalq yazıçısı Anar, Birinci katibi, Xalq yazıçısı Fikrət Qoca, AYB-nin katibi, “525-ci qəzet”in baş redaktoru Rəşad Məcid, ADPU-nun rektoru, professor Cəfər Cəfərov, prorektorları, fakültə dekanları, kafedra müdirləri, müəllim və tələbələri, universitet rektorları, dövlət qurumlarının məsul şəxsləri, tanınmış və nüfuzlu mədəniyyət və incəsənət xadimləri, ziyalılar izləyiblər. Tamaşa izləyicilər tərəfindən böyük maraqla qarşılanıb.



Qeyd edək ki, Anarın ilk mətbu hekayəsi “Keçən ilin son gecəsi” əsəri əsasında yazmış olduğu pyesə ilk dəfə Gənc Tamaşaçılar Teatrında 1968-ci ildə rejissor Ulduz Əliyeva-Rəfili quruluş verib. Həmidə xala rolunu Firəngiz Şərifova canlandırıb.

Moskvanın Mərkəzi televiziyası həmin hekayəni səhnələşdirərək iki dəfə iki müxtəlif quruluşda Birinci proqramla nümayiş etdirib. Birinci quruluşda (8 yanvar 1967-də efirə gedib, rejissor B.Talmazov) Həmidə xala rolunda SSRİ Xalq artisti L.Dobrjanskaya, ikinci quruluşda (5 yanvar 1968-də efirə gedib, rejissor Rıjov) həmin rolda RSFSR Xalq artisti Fadeyeva çıxış edib. Həmçinin əsərə Azəbaycan televiziyasında Ramiz Həsənoğlu quruluş verib. Həmidə xala rolunu Zərnigar Ağakişiyeva ifa edib. ”Azərbaycanfilm” kinostudiyasında isə Anarın ssenarisi əsasında ”Ötən ilin son gecəsi” filmi çəkilib. Quruluşçu rejissorlar Gülbəniz Əzimzadə və Şahmar Ələkbərovdur. Həmidə xala rolunu isə Elmira Şabanova ifa edib.



Beləliklə, son dərəcə uğurlu səhnə və ekran həyatı yaşayan əsərə bu dəfə tələbələrin yazıçının 80 illik yubileyi münasibətilə müraciət etməsinin, həm də Ramiz Həsənoğlunun bu tamaşaya quruluş verməsinin xüsusi əhəmiyyəti var. Tamaşada əsərin dərin fəlsəfi mənası ilə yanaşı, həm də müasir dövrümüzlə səsləşəcək ideyalar irəli sürülüb.

Tamaşanın nümayişindən sonra çıxış edən rektor Cəfər Cəfərov bildirib ki, biz bu gün gözəl və maraqlı vaxt keçirdik. Biz bu gün Anar dünyasına, mənəviyyat dünyasına baş vurduq. Bu il Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100 ili tamam oldu. Müdrik babalarımız yüksək dəyərlərimizi yaratdılar, sonrakı nəsillər bu dəyərləri daha da zənginləşdirdilər. Bu yüksək dəyərlərin arasında Anar dəyərləri xüsusi yer tutur. Universitetimizin tələbələrinin hazırladıqları bu tamaşa Anarın 80 illik yubileyinə gözəl hədiyyədir. Pərvin Nurəliyeva istedadlı yazıçı və müəllim olmaqla yanaşı, həm də aktyorluq istedadına malikdir. Rektor çıxışının sonunda Xalq yazıçısı Anara, tamaşanın rejissoru Ramiz Həsənoğluna, prodüseri Pərvin Nurəliyevaya, tələbə-gənclərə təşəkkür edərək onlara uğurlar arzulayıb.

Xalq yazıçısı Anar çıxışında qeyd edib ki, bu tamaşa onun 80 illik yubileyinə gözəl hədiyyədir. O, tamaşanın hazırlanmasına görə Ramiz Həsənoğluna, Pərvin Nurəliyevaya və tələbələrə dərindən təşəkkür edib.

Rejissor Ramiz Həsənoğlu çıxışında bildirib ki, gənclərlə işləmək ona stimul verir. Rejissor universitetin tələbələrinin tamaşanın hazırlanması ilə bağlı onlara bəslənilən inamı layiqincə doğrultduqlarını vurğulayıb.

Pərvin Nurəliyevaya çıxış edərək tamaşanın hazırlanması üçün göstərilən dəstəyə görə ADPU-nun rəhbərliyinə, həmçinin bu işdə əməyi keçən hər kəsə təşəkkür edib.

Sonda rektor Cəfər Cəfərov təşəkkürnamələri təqdim edib, xatirə şəkli çəkdirilib.

**Könül Nərimanqızı**

## ADPU-nun Quba Filialında ümummilli lider Heydər Əliyevin anım gününə həsr olunmuş silsilə tədbirlər



Dekabrın 4-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialının Tələbə Gənclər Təşklatının (TGT) sədri Həcər Seyidəhmədova başda olmaqla Quba şəhərində yerləşən Heydər Əliyev Mərkəzinə ziyarət təşkil olunub və burada ulu öndər Heydər Əliyevin həyat və siyasi fəaliyyəti haqqında tələbə-gənclərə ətraflı məlumat verilib.

Dekabrın 10-da Quba Rayon Gənclər və İdman İdarəsinin təşkilatçılığı ilə ADPU-nun Quba Filialının bir qrup fəal tələbəsi Fəxri Xiyabanda xalqımızın ümummilli lideri Heydər Əliyevin məzarını ziyarət edərək, xatirəsini ehtiramla yad edib, məzarı önünə gül dəstələri qoyublar.

Dekabrın11-də filialda ulu öndər Heydər Əliyevin anım gününə həsr olunmuş tədbir keçirilib. Tədbirdə filialın rəhbərliyi, professor-müəllim heyəti və tələbələri iştirak ediblər.

Dekabrın 12-də filialın rəhbərliyi başda olmaqla, professor-müəllim heyəti və tələbələr Quba Rayon İcra Hakimiyyətinin və rayon ictimaiyyətinin nümayəndələri ilə birlikdə Quba şəhərində yerləşən Heydər Əliyev Mərkəzində ümummilli lider Heydər Əliyevin abidəsini ziyarət edib, abidənin önünə əklil və gül dəstələri qoyaraq Ulu Öndərə məhəbbət və ehtiramlarını ifadə ediblər.

## Filologiya fakültəsində onlayn bağlantı



Dekabrın 26-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin professor-müəllimləri və tələbələri ilə Türkiyə Respublikasının Qars - Qafqaz Universitetinin, Ukrayna Respublikasının Odessa Ekologiya və Politexnik Universitetinin, eləcə də Odessadakı Azərbaycan diasporu nümayəndələrinin onlayn görüşü keçirilib.

Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsindən sonra görüş iştirakçılarını salamlayan Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova “Dünya azərbaycanlılarının həmrəyliyi gəncliyin gözü ilə” mövzusunda təşkil edilən onlayn bağlantının əsas məqsədinin universitetimizlə müxtəlif ölkələrin universitetləri arasında əlaqələri genişləndirmək, dünya azərbaycanlılarının həmrəyliyini, fikir və düşüncə birliyini bir daha nümayiş etdirməkdən ibarət olduğunu qeyd edib.

Qarşılıqlı hörmət və ruh yüksəkliyi şəraitində keçən görüşdə universitetlərin tələbələri fəal iştirak edərək öz fikirlərini bölüşüblər. Tələbələrin söylədikləri şeirlər və milli musiqi alətimiz olan sazda səsləndirilən mahnılar iştirakçılara xoş əhvali-ruhiyyə bəxş edib. Çıxış edənlər universitetlər arasında ilk dəfə keçirilən belə onlayn bağlantılara böyük ehtiyac olduğunu və bu tipli görüşlərin gələcəkdə davam etdirilməsinin zəruriliyini xüsusi vurğulayıblar.

# Pedaqoji Forumun VII dinləməsi

Dekabrın 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) himayəsi ilə təşkil edilən Pedaqoji Forumun (PF) 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Gününə həsr edilmiş VII



dinləməsi keçirilib. Görüşdə Almaniya Federativ Respublikasının Münhen şəhərində Helmholtz Elmi-Tədqiqat Mərkəzində Dinamik sistemlər şöbəsinin müdiri vəzifəsində çalışan dünya şöhrətli riyaziyyatçı alim, professor, Humboldt mükafatı alan ilk azərbaycanlı Məsud Əfəndiyev "Elmlərin konvergensiyası: Riyaziyyatın burada rolu" mövzusunda məruzə ilə çıxış edib. Dinləmədə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, şöbə müdirləri, professor-müəllimləri, təhsil ekspertləri, müvafiq sahədə tədqiqatlar aparan alimlər və pedaqoji ictimaiyyətin nümayəndələri, tanınmış ziyalılar iştirak ediblər. Dinləmədən öncə Azərbaycan Respublikasının Diaspora İş üzrə Dövlət Komitəsinin professor Məsud Əfəndiyevlə bağlı hazırladığı film nümayiş etdirilib.

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov tədbiri giriş sözü ilə açaraq görkəmli alim Məsud Əfəndiyevin həyat və elmi fəaliyyəti haqqında məlumat verib. Dosent E.Aslanov bildirib ki, Məsud Arif oğlu Əfəndiyev 1953-cü il oktyabr ayının 21-də Zaqatala rayonunda qulluqçu ailəsində anadan olub. 1970-ci ildə Zaqatala şəhərindəki Şıxəli Qurbanov adına məktəbi qızıl medalla bitirərək Azərbaycan Dövlət Universitetinin (indiki BDU) Mexanika-riyaziyyat fakültəsinə qəbul olunub. İki il BDU-da təhsil aldıqdan sonra təhsilini M.V.Lomonosov adı-



na Moskva Dövlət Universitetində davam etdirib, aspirantura, doktorantura pillələrinə qalxaraq uğurla namizədlik, sonra isə doktorluq dissertasiyalarını müdafiə edib. Diplom işini professor Mark Vişik və Aleksandr Şnirelmanın elmi rəhbərliyi ilə yazıb. Bu diplom işi 1975-ci ildə nəşr üçün akademik Əşrəf Hüseynov tərəfindən "Azərbaycan SSRİ Elmlər Akademiyasının Məruzələri" jurnalına təqdim edilib. 1991-ci ildən Almaniyada yaşayan alim bu ölkənin müxtəlif universitetlərində, o cümlədən Münhen, Ştutqart, Berlin universitetlərində çalışıb. 2005-ci ildə Yaponiyanın nüfuzlu «Japan Society for the Promotion of Science - JSPS» təşkilatının mükafatına layiq görülüb. M.Əfəndiyev postsovet məkanında dünyanın 6 aparıcı elmi jurnalının redaksiya heyətinin üzvü olan yeganə riyaziyyatçı alimdir. Dünya elmində ən yüksək təltiflərdən sayılan, Almaniya Hökumətinin təsis etdiyi "Aleksander fon Humboldt" mükafatının ilk azərbaycanlı laureatı kimi tarixə düşüb. 2014-cü ildə Münhendə M.Əfəndiyevin 60 illik yubileyinə həsr olunmuş "Biologiya, fizika və mexanikada qeyri-xətti təzahür" Beynəlxalq konfransı keçirilib. 10 aparıcı beynəlxalq jurnalın redaksiya şuralarının üzvü olmaqla bərabər, "International Journal of Biomathematics and Biostatistics" jurnalının baş redaktoru, Yaponiya, Almaniya, ABŞ və İsveçrədə nəşr olunan beş monoqrafiyanın müəllifidir. Bu il yanvarın 1-dən iyunun 30-dək Kanadanın ən böyük şəhəri olan Torontoda yerləşən Toronto Universiteti və Fields Universitetinə dəvət edilib. O, Riyaziyyat fakültəsində Riyazi biologiya üzrə mühazirələr oxuyub. Qeyd etmək lazımdır ki, bu universitetlər adətən mühazirə oxumaq üçün "Deans Distinguished Professor" statusunda olan Nobel və Fields mükafatı laureatlarını dəvət edirlər.

Professor M.Əfəndiyev öncə təqdimatın keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib, universitetin kollektivinə uğurlar arzulayıb. Qeyd edib ki, Azərbaycandakı ictimai-siyasi prosesləri diqqətlə izləyir. Son illər ADPU müəllim hazırlığı sahəsində sanballı uğurlar qazanıb və bu, onu çox sevindirir.

Sonra "Elmlərin konvergensiyası: Riyaziyyatın burada rolu" mövzusunda məruzə ilə çıxış edən professor M.Əfəndiyev qeyd edib ki, "konvergensiya" latın sözü olub, "yaxınlıq", "yaxınlaşma" deməkdir. XXI əsrin elmi-texnoloji yenilikləri riyaziyyat elmini biologiya, səhiyyə, ekologiya və digər sahələrlə yaxınlaşdırır və əlaqələri genişləndirir. Bu əlaqələr qarşılıqlı şəkildə inkişaf edir, hər iki tərəfə böyük faydalar verir. Riyaziyyat elmi artıq öz klassik mahiyyətini itirib. Yeni nəsil riyaziyyatçılar yetişib, riyaziyyata yeni baxışlar, yeni modellər yaranıb. Tətbiqi riyaziyyat artıq yox olmaq üzrədir. Riyaziyyat elmi həm də tarix, sosiologiya ilə bağlıdır. Məsələn, miqrasiya prosesində riyaziyyatın rolu böyükdür. Riyaziyyatçılara isə təkamül modellərini hazırlamaq üçün tarix elmi kömək edir. Riyaziyyat elmi bəşəriyyət qarşısında yeni üfüqlər açır. Qərbdə fundamental elmlərlə humanitar elmlər bir-birini tamamlayır, vəhdət halında inkişaf edir. Buna görə də fundamental və humanitar elmlərə vəhdətdə yanaşmaq olduqca vacibdir.





Daha sonra professor M.Əfəndiyev iştirakçıların həm mövzu, həm də Qərb təhsil sistemi və qabaqcıl beynəlxalq təcrübə ilə bağlı suallarını cavablandırıb.

Tədbirin sonunda çıxış edən rektor Cəfər Cəfərov qeyd edib ki, bugünkü görüş və məruzə elmin populyarlaşdırılması, elmi-tədqiqatların əməli fəaliyyətə tətbiqi baxımından çox faydalıdır. Universitet mədəniyyət, təhsil məkanıdır. ADPU-nun cəmiyyətdə missiyası tam fərqlidir. Belə görüşlər bizim üçün olduqca vacibdir. Rektor universitetin kollektivinə bu gözəl günü yaşatdığına görə professor M.Əfəndiyevə təşəkkür edib, alimə yeni-yeni uğurlar arzulayıb.

Sonda xatirə şəkli çəkdirilib.

**Mənsur Qüdrətoğlu**

# Riyaziyyat və informatika fakültəsində görüş



Dekabrın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Riyaziyyat və informatika fakültəsində Bakı şəhərinin Binəqədi rayonunun 246 nömrəli tam orta məktəbin müəllim və şagirdləri ilə görüş keçirilib.

Tədbiri fakültənin dekanı, professor Maqsud Nəcəfov açaraq tədbir iştirakçılarını qarşıdan gələn 31 Dekabr- Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə təbrik edib, onlara xoş arzularını bildirib. Professor M.Nəcəfov çıxışında məktəbin müəllim və şagirdlərinə ADPU-da yaradılmış sağlam və şəffaf təhsil mühitindən, uğurla həyata keçirilən islahatlardan, yeniliklərdən, gerçəkləşən tədbirlərdən ətraflı məlumat verib, şagirdlərə universitetimizin tələbəsi olmağı arzu edib.

Sonra Riyaziyyat və onun tədrisi metodikası kafedrasının müdiri, professor Azadxan Adıgözəlov, dekan müavini, dosent Nahidə Acalova çıxış edərək şagirdlərə müəllim peşəsinin şərəfindən, müqəddəsliyindən və vacibliyindən danışıblar.

Sonda 246 nömrəli tam orta məktəbin riyaziyyat müəllimi Mahizər Vəliyeva çıxış edərək görüşün keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib və universitetin kollektivinə uğurlar arzulayıb.

# İmtahan sessiyası möhkəm intizam və ciddi məsuliyyət dövrüdür

Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) müəllimə inam və etimadı özünə qaytara bilmişik. Üçüncü ildir ki, imtahanları şifahi keçirməyə nail olmuşuq. Halbuki bu təhsil müəssisəsində, demək olar ki, bütün fənlər, o cümlədən "İfadəli oxu", "Nitq mədəniyyəti", "Nitq inkişafı" belə testlə, ən yaxşı halda, yazılı şəkildə keçirilərdi.

Məlum məsələdir ki, seminar məşğələlərində və yaxud imtahanlarda intonasiya və orfoepiyanı, bir sözlə, ədəbi tələffüz vərdişlərini ifadə etmək mümkün deyil. Ancaq əvvəllər seminarlarda da testlə iş aparılır, imtahanlarda da nitq qabiliyyəti testlə yoxlanılardı. Beləliklə, tələbənin ədəbi dil normaları əsasında şifahi nitqə yiyələnməsi biliklə yoxlanılmış və qiymətləndirilmiş olardı. Bu faktın özü bir növ işin düzgün qurulmadığından, ekstensiv meyillərin kök salmasından xəbər verərdi. Belə bir halın uzun müddət davam etməsinin səbəbi müəllimə inamsızlıqdan başqa bir şey deyildi. Eyni zamanda bu inamsızlığa da təbii ki, müəllimlər əsas vermişdilər.

İndi isə buz ərimişdir. Təmənnasız xidmət şüarımızdır. Müəllimə inamı qaytara bilmişik. Üçüncü ildir ADPU-da "Nitq mədəniyyəti" fənninin testlə deyil, şifahi keçirilməsi məsələsi qaldırılmış və rəhbərlik müəllimə inanmışdır.

Bu hal seminarları həm də imtahanlara hazırlıq mərhələsinə çevirir və tələbələrin şifahi nitqin - ədəbi tələffüz normalarına görə təkmilləşdirilməsinə güclü təsir göstərmiş olur.

Ötən dərs ilinin yaz semestrinin imtahan sessiyasının imtahanlarında universitetin rektoru, professor Cəfər Cəfərov tələbələrin cavablarını xeyli dinlədi. Onların ədəbi dilin tələffüz normalarına ədəbi-bədii nitq parçaları əsasında necə yiyələndiklərinə diqqət yetirdi. Və onların necə qiymətləndirildiklərinin şahidi oldu. Bu dərs ilində "Şagirdlərin rabitəli nitqinin inkişaf etdirilməsi" seçmə fənninin imtahanlarının da şifahi keçirilməsi qərarı verilmişdir.

Tələbələr ifadə və inşa qurmaq üzrə bacarıqlar nümayiş etdirməyə hazırlaşırlar. Onlar ifadə və inşa üzrə, yeni rabitəli nitqin inkişafı üzrə nəsr və nəzm parçalarından ibarət mətnlərin təhlili standartlarını realizə etmək səriştəsi göstərəcəklər.

Tələbələrimizə inanırıq. Seminar məşğələlərində onlar ədəbi dilimizin yazılı və şifahi normaları əsasında ifadələri inşaya çevirmək, habelə inşaları ideyaca, həcmcə və məzmunca inkişaf etdirmək vərdişlərinə yiyələndiklərini nümayiş etdirə biləcək. Onların ən uğurlu bacarıqlarından biri nəzmi nəsrə çevirmək metodikasıdır. Bu mövzuda Nizami Gəncəvinin "Bərdənin tərifi", Məhəmməd Füzulinin "Söz", Məmməd Arazın "Səninləyəm", Qabilin "Azərbaycan əsgəri" əsərlərindən müvafiq parçaları deklamasiya etmək, habelə nəsrə çevirməyə çalışacaqlar.

Tələbələrimizin "Nitq inkişafı", "İfadəli oxu", "Nitq mədəniyyəti" və b. fənlərə həvəs göstərməyi həm ixtisas amili ilə bağlıdırsa, həm də imtahanların şifahi şəkildə keçirilməsi ilə bağlıdır. Eyni zamanda bizdə "Gənc natiqlər" qrupu fəaliyyət göstərir. Onlar Heydər Əliyev natiqlik məktəbinin davamçılarıdır. Qrupdan universitetin tədbirlərində istifadə olunacağı planlaşdırılır.

Ulu öndər Heydər Əliyev demişdir: "Təhsil millətin gələcəyi, müstəqil dövlətin təməlidir". Universitetdə obyektivlik, aşkarlıq ab-havası hökm sürür və bu istiqamətdə nəzarətin gücləndirildiyi, məsuliyyətin yüksəldiyi bir gerçəklikdir. Əvvəlki illərdə yol verilən nöqsanlara, müəllim adına ləkə gətirənlərə qərarımız qətidir.

**Vaqif Qurbanov,**
**Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının dosenti**



# Riyaziyyatçı alim və ictimai xadim Maqsud Nəcəfovun 70 illik yubileyinə

Göz açdın dünyaya cənnət məkanda
Güldü Zəngəzurun daşı, a Maqsud!
Qürur verdi ucalığın dağlara,
Sevindi zirvəsi, başı a Maqsud!

Ağudi naləsiz günün olmadı,
Günəşin olmadı, günün olmadı,
Bu dərd ürəyindən sürgün olmadı,
Duymaz bu sitəmi naşı, a Maqsud!

Sevinirik səni qəlbən sevincə,
Həyatını yaşa incə, sev incə,
Qovuş Vətəninə, dönsün sevincə
Gözlərində həsrət yaşı, a Maqsud!

Söz duymayan görüb yaman göynədin,
Məmməd Arazları əzbər söylədin,
Rəqəmlərlə düşünəni eylədin
Şairlərə qan qardaşı, a Maqsud!

Elmin qayğıları yükündür belə,
Elmə kəc baxanı axıt sən selə,
Səksəndə, doxsanda qoşulub elə
Vətən qeyrətini daşı, a Maqsud!

Ləyaqət var sənin əsli-soyunda,
Şərəf, vüqar əks olunub boyunda,
Nəticənin, kötücənin toyunda
Bəy-gəlinlə dur yanaşı, a Maqsud!

Uzun ömür yarışında bir ol sən,
Gümrah qocal, nümunə ol, pir ol sən,
Qıvraqlıqda təbabətə sirr ol sən,
Cavanlaşdır sən yüz yaşı, a Maqsud!

**Məhərrəm Hüseynov,**
**filologiya üzrə elmlər doktoru, professor**

## ADPU-nun Şəki Filialında Mikayıl Müşfiqin 110 illiyinə həsr olunmuş elmi konfrans

Dekabrın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında Mikayıl Müşfiqin anadan olmasının 110 illiyi münasibətilə “Poeziyamızın günəşi - Mikayıl Müşfiq” adlı tədbir keçirilib. İki hissədən ibarət olan tədbirin I hissəsi elmi konfrans şəklində təşkil olunub.




Konfransı giriş sözü ilə filialın elmi işlər üzrə direktor müavini, dosent Nurəli Çələbiyev açaraq tədbirin məqsədi haqqında iştirakçılara məlumat verib. Konfransda filialın müəllim və tələbələrinin Mikayıl Müşfiqin həyat və yaradıcılığına həsr olunmuş məruzə və çıxışları dinlənilib. Ümumelmi fənnlər kafedrasının baş müəllimi Mətanət Mustafayeva “Mikayıl Müşfiqin həyatı”, Humanitar elmlər kafedrasının baş müəllimi Rasimə Əhmədova “Mikayıl Müşfiqin yaradıcılığı”, “Azərbaycan dili və ədəbiyyatı müəllimliyi” ixtisasının IV tədris ilinin tələbəsi Məleykə Mahmudova “Mikayıl Müşfiqin yaradıcılığında məhəbbət mövzusu”, Humanitar elmlər kafedrasının müəllimi Nübar İbrahimova “Mikayıl Müşfiqin yaradıcılığında uşaq ədəbiyyatı nümunələri”, “Azərbaycan dili və ədəbiyyatı müəllimliyi” ixtisasının IV tədris ilinin tələbəsi Lalə Əyyubzadə “Mikayıl Müşfiq və gözəllik” mövzularında məruzə ilə çıxış ediblər.

Tədbirin II hissəsində isə filialın tələbələri Mikayıl Müşfiqin yaradıcılığına həsr olunmuş ədəbi-bədii kompozisiya nümayiş etdiriblər. Filialın tələbələri şairin şeirlərini səsləndiriblər. Mikayıl Müşfiqin həyat və yaradıcılığını əhatə edən videoçarx da tədbir iştirakçıları tərəfindən maraqla qarşılanıb.

Tədbirin sonunda dosent Nurəli Çələbiyev və Ümumelmi fənlər kafedrasının müdiri, pedaqogika üzrə fəlsəfə doktoru Sədrəddin Bədiyev çıxış edərək Mikayıl Müşfiqin Azərbaycan ədəbiyyatı tarixində mövqeyindən danışıb və tədbirin hazırlanmasında rolu olan müəllim və tələbələrə öz təşəkkürlərini bildiriblər.

## ADPU-nun nəzdində ADPK-də “Unudulmaz şəxsiyyət” adlı tədbir

Dekabrın 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində ulu öndər Heydər Əliyevin anım gününə həsr olunmuş “Unudulmaz şəxsiyyət” adlı tədbir keçirilib. Tədbirdə kollecin rəhbərliyi, Yasamal Rayon İcra Hakimiyyətinin (RİH) İctimai-siyasi və humanitar məsələlər üzrə şöbə müdiri Zöhrab Cəfərov, müəllim və tələbə heyəti iştirak edib.

Tədbiri giriş sözü ilə açan kollecin direktoru, dosent İsrayıl İsgəndərov müasir Azərbaycanın qurucusu, ümummilli liderimiz Heydər Əliyevin misilsiz xidmətlərindən danışaraq, Ulu Öndərin Azərbaycanın xoşbəxtliyi və firavanlığı, bölgədə və dünyada sülh naminə göstərdiyi fövqəladə xidmətlərindən danışıb.



Yasamal RİH-in İctimai-siyasi və humanitar məsələlər üzrə şöbə müdiri Zöhrab Cəfərov öz çıxışında milli xilaskarımız olan Heydər Əliyevin Azərbaycan xalqının tarixi boyu yetişdirdiyi qeyri-adi şəxsiyyətlərdən biri olduğunu qeyd edərək, vəfatından sonra belə milyonların qəlbində yaşadığını, millət fədaisi kimi daim böyük ehtiramla, rəğbətlə xatırlandığını bildirib.



Kollecin müəllimlərindən Xarici dillər fənn birləşmə komissiyasının sədri İlhamə Əsgərova “Milli mənsubiyyətimizin, milli varlığımızın əbədi təcəssümcüsü” və Humanitar fənn birləşmə komissiyasının müəllimi Gülnarə Sadıqova “Heydər Əliyev və tarixi şəxsiyyət” mövzularında məruzələrlə çıxış ediblər.

Tələbələrin ifasında ulu öndər Heydər Əliyevə həsr olunmuş ədəbi-bədii kompozisiya nümayiş etdirilib, həmçinin dünya siyasi xadimlərinin Heydər Əliyev haqqında söylədikləri dəyərli kəlamlar səsləndirilib.

## ADPU-nun Ağcabədi Filialında ulu öndər Heydər Əliyevin anım günü münasibətilə elmi-praktiki konfrans

**Dekabrın 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında ümummilli liderimiz Heydər Əliyevin anım günü münasibətilə “Heydər Əliyev və müasir Azərbaycan” mövzusunda elmi-praktiki konfrans keçirildi.**



Əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirildi.

Ümummilli Liderimizin xatirəsi bir dəqiqəlik sükutla yad edildi.

Konfransı giriş sözü ilə açan filialın direktoru, dosent Mətanət Fərzəliyeva xalqımızın xilaskarı, unudulmaz liderimiz Heydər Əliyevin keçdiyi şərəfli ömür yolunun mühüm məqamlarına toxundu. Qeyd etdi ki, bu günlərdə qədirbilən xalqımız öz ləyaqətli oğlu Heydər Əliyevi Vətən və millət qarşısındakı tarixi xidmətlərinə görə böyük minnətdarlıq hissi ilə xatırlayır. Ümummilli Liderin zəngin ictimai-siyasi fəaliyyətinin hərtərəfli öyrənilməsi və təbliği məqsədilə respublikamızın hər yerində, idarə və müəssisələrdə, təhsil müəssisələrində yığıncaqlar, elmi-praktiki konfranslar keçirilir.

Sonra məruzələr dinlənildi.

İlk məruzə üçün söz filialın Tərbiyə işləri üzrə direktor müavini, dosent Mahir Səlimova verildi.

“Heydər Əliyev müstəqil Azərbaycan dövlətinin memarıdır” mövzusunda məruzə edən M.Səlimov ümummilli liderimiz Heydər Əliyevin ictimai-siyasi fəaliyyətindən, məqsədyönlü siyasət xəttindən və dahi şəxsiyyətin xalqımız üçün miras qoyduğu mənəvi dəyərlər haqqında ətraflı məruzə etdi. Bildirdi ki, Ulu Öndərin siyasi kursu hazırkı dövrdə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən layiqincə davam etdirilir. Məhz dahi liderimizin başlatdığı uğurlu siyasətin nəticəsidir ki, ölkəmiz ildən-ilə böyük nailiyyətlər əldə edir, sürətli inkişafı ilə dünya dövlətləri tərəfindən tanınmağa və qəbul edilməyə layiq bir ölkə səviyyəsinə çatmışdır. Məruzəçi onu da vurğuladı ki, görkəmli dövlət xadimi və dünya miqyaslı siyasətçimiz Heydər Əliyev Azərbaycanın milli dövlətçiliyini bütün təhlükələrdən qoruyaraq özündən sonra müstəqil Azərbaycan Respublikasını bizlərə ən dəyərli miras olaraq qoydu. Bizim vətəndaşlıq qayəmiz ondan ibarət olmalıdır ki, Ulu Öndərin bizə verdiyi əmanətlərə sahib çıxaq və onu xain əllərdən qoruyaq.

Növbəti məruzə üçün söz filialın İctimai, təbiət fənləri və onların tədrisi metodikası kafedrasının dosenti Məhəmməd Hüseynova verildi.

“Müstəqil Azərbaycan dövlətinin xarici siyasət kursunun formalaşmasında Heydər Əliyevin rolu” mövzusunda məruzə edən dosent M.Hüseynov Azərbaycanı dünyaya tanıdan, onu müstəqil, suveren dövlət səviyyəsində qurub inkişaf etdirən Ulu Öndərin xarici siyasət kursu haqqında ətraflı danışdı. Vurğuladı ki, Heydər Əliyevin həyat və ictimai-siyasi fəaliyyəti müasir tariximizin ən mühüm və şərəfli mərhələsini təşkil edir. Təsadüfi deyildir ki, Heydər Əliyevin Azərbaycana rəhbərlik etdiyi illər tariximizin qızıl dövrü kimi yaddaşlara əbədi həkk olunub. Gördüyü cahanşümul işlərin nəticəsidir ki, Azərbaycan mühüm beynəlxalq tədbirlərə ev sahibliyi edir və inkişaf etmiş ölkələrlə əməkdaşlıq şəraitində yaşayır.

Məruzəçi Heydər Əliyevin siyasi hakimiyyət illərində xalqımızın əldə etdiyi mühüm nailiyyətlərdən danışarkən əminliklə qeyd etdi ki, nə qədər ki, Azərbaycan xalqı var və yaşayır, Heydər Əliyev də xalqın qəlbində əbədi yaşayacaqdır.

Məruzə üçün söz filialın Xüsusi və ümumelmi fənlər kafedrasının müəllimi Aygün Əlizadəyə verildi. “Heydər Əliyev və Azərbaycançılıq ideologiyası” mövzusunda məruzə edən A.Əlizadə Ulu Öndərimizin bizə öyrətdiyi və miras qoyduğu Azərbaycançılıq ideologiyasının mühüm komponentləri barədə ətraflı danışdı. Vurğuladı ki, Ümummilli Liderimiz Azərbaycançılıq ideologiyasının mənbəyini real müstəqilliyə nail olmaq, vahid, bölünməz Azərbaycanı qoruyub saxlamaq və onu möhkəmləndirməkdə görürdü. Odur ki, Ulu Öndərimizin bizə əmanət etdiyi müstəqil Azərbaycanı qorumağa, inkişaf etdirməyə və öz əməllərimizlə onu daim yaşatmağa borcluyuq.

“Heydər Əliyevin müstəqil Azərbaycanda elm və təhsilin inkişafında rolu” mövzusunda məruzə edən filialın Tədris və elmi işlər üzrə direktor müavini, dosent Seymur Süleymanov Ümummilli Liderimizin siyasi fəaliyyət illərində Azərbaycan təhsilinin inkişafı istiqamətində aparılan işlərdən danışdı. Təhsilin keyfiyyətinin yüksəldilməsi, Azərbaycan təhsilinin dünya təhsil sisteminə inteqrasiyası, yüksəkixtisaslı kadr potensialının yaradılması kimi vacib məsələlərin ulu öndər Heydər Əliyevin təhsil siyasətinin başlıca meyarı olduğunu vurğuladı.

Növbəti məruzə üçün söz filialın Xüsusi və ümumelmi fənlər kafedrasının baş müəllimi, tarix üzrə fəlsəfə doktoru Əlizadə Nəcəfova verildi. “Heydər Əliyev milli-mənəvi dəyərlərimiz haqqında” mövzusunda məruzə edən Ə.Nəcəfov xalqımızın min illər boyu əldə etdiyi, lakin məlum səbəblər üzündən az qala unutdurulan mühüm milli-mənəvi dəyərlərə yenidən sahib olması kimi məsələlərdə Ulu Öndərimizin misilsiz xidmətlərindən danışdı. Ana dilimizin dövlət dili kimi qəbul edilməsi, milli mədəniyyətimizin inkişafı, ədəbiyyat və incəsənət sahəsində atılan addımlar, xalqımızın qədimdən yaşam tərzinə çevrilmiş adət-ənənələrinin yenidən boy göstərməsi, milli bayramımız olan Novruzun respublika səviyyəsində qeyd edilməsi, dini inanc və etiqadımıza sərbəst şəkildə əməl etmək kimi dəyərlər, məhz Ulu Öndərimizin öz xalqına sonsuz məhəbbəti və Onun adət-ənənələrinə sədaqətinin bariz nümunəsidir.

“Heydər Əliyevin gənclər siyasəti” mövzusunda məruzə edən filialın İctimai, təbiət fənləri və onların tədrisi metodikası kafedrasının baş müəllimi, tarix üzrə fəlsəfə doktoru Anar Kərimli qeyd etdi ki, Heydər Əliyevin Azərbaycan gənclərinə göstərdiyi etimadın nəticəsidir ki, bu gün ölkəmizdə sağlam düşüncəli, düzgün əqidəli, Vətəninə və xalqına məhəbbətlə xidmət edən gənclər ordusu yetişmişdir. Bu günün gəncləri şüurlu şəkildə öz vətəndaşlıq borcunu anlayır və özünü inkişaf etdirir. Təsadüfi deyildir ki, Ulu Öndər Azərbaycan gənclərinə inanır və onların cəmiyyətdə təmsil olunmasına xüsusi önəm verirdi. Bu gün də gənclər siyasəti Ulu Öndərimizin layiqli siyasi varisi cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilir.

Sonda çıxış üçün söz filialın Dillər, ədəbiyyat və onların tədrisi metodikası kafedrasının dosenti Sabir Məmmədova verildi. Dosent S.Məmmədov da öz növbəsində xalqımızın xilaskarı, ümummilli liderimiz Heydər Əliyevi minnətdarlıq hissi ilə anaraq, Onun dövlətçiliyimiz uğrunda apardığı mübarizənin mayasında Şah İsmayıl Xətai ruhunun dayandığını, xalqımızın dövlətçilik tarixində şanlı səhifə yazmasından fəxarətlə danışdı.

Elmi-praktiki konfrans xalqımızın gələcəyinə, Azərbaycanımızın əbədiliyinə, işğal altında olan torpaqlarımızın tez bir zamanda azad ediləcəyinə inam və bu işdə Ali Baş Komandanımız cənab İlham Əliyevin apardığı məqsədyönlü siyasət ətrafında sıx birləşmək məramı ilə yekunlaşdı.

## ADPU-nun Şamaxı Filialında ümummilli lider Heydər Əliyevin anım gününə həsr olunmuş tədbir

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında ümummilli lider Heydər Əliyevin anım gününə həsr olunmuş tədbir keçirildi. Tədbirdə filialın rəhbərliyi, professor-müəllim heyəti və tələbələri iştirak edirdilər.**

Tədbirdən öncə filialın rəhbərliyi başda olmaqla, professor-müəllim heyəti və tələbələri Şamaxı Rayon İcra Hakimiyyətinin və rayon ictimaiyyətinin nümayəndələri ilə birlikdə rayon mərkəzində yerləşən ümummilli lider Heydər Əliyevin abidəsini ziyarət etdilər, abidənin önünə tər çiçəklər düzərək Ulu Öndərə məhəbbət və ehtiramlarını ifadə etdilər.



Filialda keçirilən anım tədbirinin davamı Ulu Öndərin əziz xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlandı.

Ulu Öndərin həyat və fəaliyyətindən bəhs edən “Dahi şəxsiyyət” adlı film nümayiş olundu.

Tədbiri giriş sözü ilə açan Tədris və elmi işlər üzrə direktor müavini, filologiya üzrə fəlsəfə doktoru Şasəddin Mikayılov qeyd etdi ki, Azərbaycan var olduqca ölkəmizin bütün sahələrində həyata keçirilən uğurların əsasını qoymuş Ulu Öndərin adı hər zaman Azərbaycanla qoşa çəkiləcək və qədirbilən xalqımızın qəlbində daim yaşayacaqdır.

Humanitar və xüsusi fənlər kafedrasının müdiri, dosent Mayıl Alıcanov öz çıxışında bildirdi ki, ölkəmizin bütün sahələrində olduğu kimi, elm və təhsil sahəsində də davamlı inkişafın təməlini məhz ulu öndər Heydər Əliyev qoymuşdur. Natiq onu da qeyd etdi ki, Heydər Əliyev tarix yaradan böyük şəxsiyyətdir.

Sonra tələbələr adından çıxış edən Aytac Mehralıyeva ulu öndər Heydər Əliyevin mənəvi dünyasının, həyat və fəaliyyətinin gənc nəsil üçün örnək olduğundan danışdı.

Sonda III tədris ili tələbəsi Günay Məmişova və I tədris ili tələbələri Dərgah Məcnunzadə, İnci Qurbanova Ümummilli Liderə həsr olunmuş şeirlər səsləndirdilər.

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zahid Xəlilə qızı, Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının dosenti

**Şəlalə Nəbiyevanın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Günay BAĞIRLI

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 54
Sayı: 1500
Çapa imzalanıb: 28.12.2018-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, “Azərbaycan” Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.